**SƏMƏD VURĞUN**

# SEÇİLMİŞ ƏSƏRLƏRİ

**BEŞ CİLDDƏ**

**II CİLD**

"ŞƏRQ-QƏRB"
BAKI-2005

*Bu kitab* ***“Səməd Vurğun.*** *Əsərləri. Yeddi clddə. II cild”*
(*Bakı, Elm, 1986*) *nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni: **Aslan Salmansoy**

Redaktoru: **Aybəniz Vurğunqızı**

**894.361 - dc 21**
**AZE**
**Səməd Vurğun. Seçilmiş əsərləri.** Beş cilddə. II cild. Bakı, “Şərq-Qərb”, 2005, 248 səh.

Azərbaycan xalqının milli-ictimai düşüncə, əxlaq və mənəviyyat, bədii təfəkkür ənənəsi XX yüzilin ortalarında öz təkrarsız əksini Səməd Vurğun poeziyasında tapır. Çünki Vurğun ilhamının poetik məcrası, onun sənətkar marağının bədii əhatə dairəsi ən geniş fəlsəfi miqyasları, coğrafi üfüqləri birləşdirir.

Dövrün böyük poeziyasını yaradan Vurğunun hətta rəsmi ideologiya qəliblərinə az və ya çox dərəcədə uyğun tərənnüm xarakterli şeirləri də yüksək poetik ilhamla və səmimi şair duyğularyla qələmə alınmışdır.

“Seçilmiş əsərləri”nin bu cildinə ilhamlı şairin 1938-1955-ci illərdə yazdığı şeirlər toplanmışdır. Bu gerçək poeziya nümunələri sovet hakimiyyəti dövründə həqiqi istedadın həmişə qarşılaşa bildiyi böyük çətinliklərin uğurlu bədii həllinin birər örnəkləridir. Həmin şeirlərin hər birində Vurğun eyni vaxtda üç qatda – Azərbaycan, Dünya və Tarix adlı üç məkanda yaşayan filosofdur.

**ISBN 9952-418-45-8**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



## AŞIQ QARDAŞIMA

Gəl qələm götürüb, qoşa saz tutaq,
Süsənlər, sünbüllər, güllər bizdədir;
Gecələr qoynuna ay qonaq gələn
Sonası çığrışan göllər bizdədir.

Bizim dünyamızda gülür gözəllik,
Deyir bu mahnını bülbül və kəklik.
Yazın səhər vaxtı güllük, çiçəklik,
Ürək sərinlədən yellər bizdədir.

Elləri sevmişdir könlüm əzəldən,
Nə çıxar uydurma şerü-qəzəldən?
Aldım ilhamımı min bir gözəldən,
Ucu tər cığalı tellər bizdədir.

Aşıq, bu yerləri sən xəbər alsan, –
Ayıldı dünyanın şöhrəti insan.
Zülmün, qaranlığın qəbrini qazan
Kürəklər, külünglər, bellər bizdədir.

Nə xoşdur ellərin şirin avazı,
Güldü ölkəmizin çiçəkli yazı,
Şairin qələmi, aşığın sazı,
Bülbülü mat qoyan dillər bizdədir.

Bu yeni aləmi duyduqca ürək,
Göylər də sevinir gülümsəyərək,
Bir böyük bağ olur hər şitil, tənək,
Bu quran, yaradan əllər bizdədir.

*1938*

## KARYERİST

Onun kinli gözlərində min tikanlı hiylə var,
Hayla girər hər iclasa, ağızlardan söz qapar...
Nahaq yerdən tələ qurar insanların başına,
Bu minvalla keçmək istər bir vəzifə başına.
O, tarixə verməmişdir hələ kiçik bir əsər,
Vicdanı boş bir saraydır, – səhər, axşam yel əsər.
Qürrəsindən qurumuşdur, kasad keçir bazarı,
Qurumsağın sifətindən kin tökülür sapsarı.
Hər gün bizə o rast gəlir, hiyləsinə yaxşı bax,
Bizim təmiz vicdanlara böhtan atır o alçaq.
Bəzən böyük kitablardan sitatlar da gətirir,
Lakin vicdan kitabını ətək altdan ötürür...
Beyni saman çuvalıdır, nə yaradır, nə qurur,
Qurduğumuz bir binaya asta-asta od vurur.
Partbileti pərdə tutub arxasında gizlənər...
O, tarixə verməmişdir hələ kiçik bir əsər.
Bəzən gözlə görünməyən qotur kimi bu azar,
Mayasız bir xəmir kimi, əl-ayağa yapışar.
O, paxıldır, o, qurdludur, gözlərindən oxunur:
Nə zaman ki bir qəhrəman buludlara toxunur,
Baxar-baxar, həsəd çəkər onun xain gözləri;
Nə zaman ki səhnəmizdə gülər sənət əsəri,
Onu yazan sənətkarı gəncliyimiz alqışlar,
Karyeristin gözlərindən axar kinli baxışlar.
"Mən də gərək alqışlanam", – deyə donar o murdar,
Lakin onda sənət üçün nə duyğu var, nə qəlb var.
Nə zaman ki cəbhələrdə sınanmış bir qəhrəman
Dastan kimi heç düşməyir insanların ağzından,
Ona baxar, nəğmə deyər qızların gül dodağı,
Karyeristin açılmayır tutqun qaşı-qabağı.
El içində, doğrudan da, gözəlcə bir məsəl var:
"Qurbağalar fil olmaqçın şişər, şişər, partlayar..."
Nə zaman ki sinəsinə aşıq basar sazını,
Şeir deyib, təsvir edər ölkəmizin yazını.
Ellər ona "aşiq", – deyə güldəstələr bağışlar,

Karyeristin küt başına yağar odlu yağışlar.
Nə zaman ki, uçan bir qız seyrə çıxar göyləri,
Ağızlardan ağızlara gəzər onun hünəri.
Sinəsinə orden taxar ölkəmizin adından,
Şairlər də ilham alar bu qəhrəman qadından,
Karyeristin dodaqları tir-tir əsib uçunar,
"Neçin qadın yaranmadım" – deyib donar o murdar.
Sən, oxucum, zənn eləmə karyeristi boşboğaz,
Onda da bir ustalıq var, onu tanı gəl bir az,
Nəymiş onun məharəti? – Bir kötükdür, bu bəlli,
Lakin başqa bir ustalıq ona verir təsəlli.
O bilir ki, kasasında nə sənət var, nə hünər,
Utanmadan boşluğunu alim kimi göstərər.
Ağır durar, ağır qalxar, bəzən süzər gözünü,
Əzbərləyər alimlərin böyük-böyük sözünü,
Yerli-yersiz misal çəkər, özü bir boş nağara,
Bir əl vursan, dınqıltısı haray salar dağlara.
Hər iclasa, hər məclisə bir baş vurub soxular,
Gurultulu nitqlərlə olmaq istər komissar.
Bir azyaşlı, təcrübəsiz çıxış vaxtı yanılsa,
Onun səhvi uşaqlığın səhvi kimi sanılsa,
Bu karyerist məqam tapıb göz ağardar uşağa,
Uydurma bir nəzakətlə burnu düşər aşağa,
Sonra başlar:
"– Sayıqlıqdan qalmamışdır bir əsər!
Düşmənlərin fikrindədir bu gün bizim körpələr,
Mənim gözüm su içməyir bu uşağın sözündən,
O da sinfi düşmən olmuş, tanıyıram gözündən..."
Dayan, dayan, qansız hərif, əl çəkmərik yaxandan!
Bizim böyük əsrimizə söylədiyin bu böhtan
Vicdanının yoldaşıdır, kömür kimi qapqara,
Bizim dünya müqəddəsdir, de sən hara, o hara?
Zəhərlədin bir çoxunu keçən illər uzunu,
Yumruğumuz əzəcəkdir sənin donuz burnunu!

*1938, 7 fevral*

## ÇİL TOYUĞUN TƏK YUMURTASI

### I

Oxucum, etiraf edirəm qəlbən
Satira gəlməyir mənim əlimdən.
Bəlkə də çatmayır buna qüdrətim,
Başqa bir ruhdadır şerim, sənətim.

Sabir sağ olsaydı bu temanı mən
Ona bağışlardım candan, ürəkdən.
Yazardı öz böyük məharətilə,
Bir aslan qəlbinin cəsarətilə,
Biz də oxuyardıq heyran qalardıq,
Bundan da başqa bir ibrət alardıq.

Qoy, yeri gəlmişkən, söyləyim sizə,
Sözüm toxunmasın şairlərimizə:
Bizim şairlərin təmiz adı var,
Fikri var, qəlbi var, istedadı var.
Gözəl vətənimiz çiçək-çiçəkdir.
Yurdumuz dahilər yetirəcəkdir.

Bugünkü şerimiz bir qızıl əsgər,
Cəbhəyə qüvvədir hər kiçik zəfər.
Bizim şairlərin qəlbində hər an
Yaşar qurduğumuz bu yeni dövran.
Bu qüvvət yaşadır, şübhəsiz bizi,
Bu qüvvət yaradır hər şerimizi.

Ancaq düşündürür məni hər zaman
Yazılmış bir şeir, bir yeni dastan...
Bəzən qoyulmayır hər söz yerinə,
Şerimiz oxşayır biri-birinə...
Eyni xəritələr, eyni şəkillər,
Xəyala açmayır yeni bir səhər

Başqa bir qüsur da ağrıdır bizi:
Bəzən unuduruq gülməyimizi...
Varmı şerimizdə məzhəkə yazan?
Oxucu gözləyir bunu hər zaman.
Unutmaq olmaz ki, doğrudan da, biz
Böyük Sabirlərin varisləriyiz.

Yetər buludlardan vurduğumuz dəm,
Bir az da gülgüdən danışsın qələm.
Bunun xeyri var ki, zərəri yoxdur,
Gülməli insanlar həyatda çoxdur.

## II

Yenə uşaqlığım yadıma düşdü...
Ömrümün günləri nə tez ötüşdü.
Bir qış axşamıydı, qapıda soyuq...
Qalxdı tar üstünə bizim çil toyuq...
Gəldi yuxu vaxtı, salındı yerlər,
Qışda gec açılır, gecikir səhər.
Aldı qucağına bizi yuxular,
Bu qış yuxusunun başqa dadı var;
Bayırda uladı qışın boranı,
Çəkdik başımıza qalın yorğanı;
Dərin bir yuxuya getdik hamımız;
Bəzən səslənirdi torpaq damımız.
Gecə yarısıydı, eşitdik birdən
Çil toyuq bağırır durduğu yerdən.
Qaq-qaq qaqqıldayır... Qaçdı yuxumuz,
Yuxudan səksənib, qalxdıq çoxumuz.
Atam acıqlanıb: "Kəs! – dedi – murdar,
Bu gecə vaxtında nə azarın var?"
Toyuq davam etdi, yenə də qaq-qaq...
Döydü qanadını şaqqıldadaraq.
Bir azdan kiridi, biz yatdıq yenə,
Qərq olduq gecənin dərinliyinə.

Birdən nə eşitdik? Səhərə yavıq
Düşmüş evimizə qara-qışqırıq.
Çil toyuq indi də banlayır, bax, bax,
Elə bil dəyişib xoruz olacaq.
Başqa toyuqlar da qoşulmuş ona,
Bəli, işlərimiz düşmüşdür yona.
Biri zurna çalır, biri nağara,
Evimiz bənzəyir toya, mağara;
Biz də qarnımızı tutub gülürük,
Kasıbın bəxtini yaxşı bilirik...
Atam hazırlanır, əlində kəsər:
"Toyuq banlayanda başı kəsilər".
"Yox, – dedim, ay ata, ona dəymə sən,
Sabah öhdəsindən, gələcəyəm mən;
Onu çox sevirəm, gümüş rəngi var,
Ona bənzəməyir başqa toyuqlar,
Bütün fərələri qovlayır bir-bir,
Ondan xoruzlar da qorxub çəkinir".
Həftələr dolandı, aylar dolandı,
Toyuğun əlindən kənd oda yandı.
Onun qaqqıltısı kəsmədi bir an,
Mən onu qurtardım qandan, bıçaqdan...
Nə bizə gün verdi, nə özü yatdı,
Bütün yuxumuzu harama qatdı.
Dedik qoy yaşasın, nə minnəti var,
Bəlkə çil toyuğun bir illəti var?

Açıldı yaz günü, əridi soyuq,
Gördüm samanlığa girdi çil toyuq.
Gözlədim çıxmadı girdim yanına;
Gördüm bir üşütmə düşüb canına;
Yaslanıb samanın üstündə cansız.
Yatır qaqqıltısız ahsız, amansız.
Məni görən kimi yerindən qalxdı,
"Hərif" təşəxxüslə baxdı, nə baxdı.
Nə gördüm? – Samanda o yurdlamışdır.

Bir fındıq boydaca yumurtlamışdır.
Tez aldım əlimə yumurtanı mən,
İstisi getməmiş hələ əlimdən –
Yüyürdüm anamın yanına birbaş,
Yumurta deyilmiş sarıca bir daş..

Oxucum! Çil toyuq getmiş dünyadan...
Arabir fikrimə gəldiyi zaman,
Bəzi insanlar da yadıma düşür,
Onların da ömrü belə ötüşür...
Onlar da bir fındıq boyda iş görər,
Özünü aləmə igid göstərər;
Hələ qabaqcadan şəsti ucalar,
Qıy vurub aləmə hay-haray salar.
"Yaratdım" deyərkən heç də utanmaz.
Onlar taleyini düşünsün bir az...

*1938, 8 fevral*

## XEYRƏ-ŞƏRƏ YARAMAZ

Bizim böyük dünyamızda müxtəlifdir adamlar.
Bir çoxunun öz şəklini çəkməlidir sənətkar.
Dünən yazdım "Karyeristi", qoy utansın – nə qəmim?!
Bu gün başqa bir temadan söhbət açır qələmim.
Düşmənlərim çoxalsa da, mən atmaram yarağı,
Qüvvətimdir, qüdrətimdir həqiqətin bayrağı.
Bir tanış var, kəsilməyir yanımızdan ayağı,
"Nə tüfəngin çaxmağıdır, nə sünbənin toxmağı".
Yırğalanar gəlin kimi bəzək vurar özünə,
Güzgü qoyub min vüqarla baxar təmiz üzünə;
Bir yerində ləkə varsa, düz bir saat deyinər;
Puşkin kimi saqqal qoyub pedant kimi geyinər
Arabir də papaq qoyub bığlarını uzadar,
O bilir ki, bu dünyada Koroğlunun adı var..
Nə dərdi var? – Qamət gözəl, geyim təzə, qaş qara,
Elə bu da kifayətdir bizim bəzi qızlara..
Bu niyyətlə qəhrəmanım yol üstünə çıxanda,
Tanış-biliş xanımların əllərini sıxanda,
İbarələr dolu kimi yağır onun ağzından,
Otuz dəfə məhəbbətə düçar olmuş azından.
O hər axşam kef çəkməyə gedər iclas adına
Yalan satar evindəki ana olmuş qadına.
Vəzifəsi kiçik bir şey, bu dincliyin yoludur –
O nə qədər xərcləsə də yenə cibi doludur.
"Bu dünyada kef qalacaq" – xəyal edir ürəkdən,
Yorulmamış ömrü boyu "bəli, bəli" deməkdən.
Desələr ki, göydə günəş kömür kimi qaralır,
Desələr ki, brilyant da hicran çəkir, saralır,
Desələr ki, ay günəşdən əlli dəfə yekədir,
Desələr ki, pendir verən, qaymaq verən təkədir,
Bütün bunlar bir yel kimi gəlib keçər yanından,
Bir istilik belə keçməz onun soyuq qanından.
"Nə işim var, neçin salım qeylu qala başımı?
Neçin incik salmalıyam öz araq yoldaşımı?

At kəlləni yastığına yaxşı uzan, yaxşı yat,
Mən dinsəm də, dinməsəm də keçinəcək bu həyat”.
Bəzən olur iclas gedir: – ayılmışıq biz artıq,
Xain çıxan bir düşmənin maskasını yırtırıq. –
Gəlir bizim bu “qəhrəman”, dal cərgədə əyləşir,
Tərpənməyən dağ gövdəsi baxanlara gəlir şir.
Lakin məclis qızışdımı, başlandımı vurhavur,
Öz-özünə: “Daha vaxtdır... tez götürül... yol budur...
Zaman özü mənsiz belə öz hökmünü verəcək,
Bəlkə, bütün vicdanlara min bir iblis girəcək” –
Deyib o dal cərgədən də kirimişcə sıpıxar,
Bizdə bir çox adamların gövdəsi var, şəsti var.
El içində bir məsəl də bunu deyir müxtəsər:
“Nə ölüyə pay göstərər, nə diriyə hay verər”.
Oxu mənim bu şerimi, xeyrə-şərə yaramaz!
Aynaya bax, sifətindən utan bir az, öl bir az!
Bir yaxşı gör, nə gündəsən, nədir sənin sənətin?
Ömründə heç döyməmisən qapısını qeyrətin.
Ya bir dəfə insan olub, daşa dönmə sükutla,
Ya bilmərrə heyvan olub biyabanda ot otla!
Sən içində yellər əsən viranə bir otaqsan,
Sən ağacda bir qurumuş, bir meyvəsiz budaqsan.
Görürsən ki, bu dünyamız gündən-günə şən olur,
Səpdiyimiz hər dənədən böyük bir gülşən olur...
Sən də bizə bir xeyir ver, sən də tərpən bir görək,
Yoxsa sənə haram olsun bu yediyin duz-çörək!
Gəl, pas atmış qılınc kimi pərçimlənmə sən qına,
Kirpi kimi çəkilmə gəl qabığına, qınına.
Öz halını düşünmə tez, xalqın üçün külüng vur,
Qeyrətsizi, xudpəsəndi tarix haqlı unudur.
Aç gözünü varlığa bax, indi başqa səhərdir,
Əbədiyyət – bu dünyada göstərilən hünərdir.

*1938, 10 fevral*

## İNCƏ XANIM

İncə xanım çox qısqanır bizim yaman nəzərlərdən,
Boynundakı ipək sapa gözmuncuğu taxır hərdən.
İncə xanım çox güvənir özündəki gözəlliyə,
Səhər çıxır yuvasından "gözəllikdə mənəm!" – deyə.
O bir bahar havasıdır, tez dəyişən halları var;
Yanağında qoşa-qoşa, kiçik-kiçik xalları var.
Dodaqları çox incədir, dişləri var mərcan kimi;
O sallanar, sığallanar canlar alan bir can kimi...
Qızın durna baxışları süzüldükcə xumar-xumar,
Ovçuların ürəyində yellər əsib, tufan qopar...
Bəzi beyniqanların da qanı qaynar, qəlbi coşar,
Ona küçə şairləri mahnı deyib söz də qoşar:

"İncə xanım, incə xanım
Bax bu qaşa, bax bu gözə.
Qurban olsun sənə canım.
Yandı bağrım, döndü közə"

Sözün düzü bu dilbərdə təbiətin vergisi var,
Qızıl güldür yanaqları sifətində gülür bahar.
Onun boyu və saçları danışılır ağız-ağız,
Nə yazıq ki, anlamamış gözəlliyin qədrini qız:

"Mən bir quşam, uçam gərək
Bir budaqdan min budağa;
Sığmaz könül, sığmaz ürək
Dörd divarlı bir otağa..."

Budur qızın fəlsəfəsi.. yoxdur onun can sirdaşı,
Gecə-gündüz dumanlıdır ayılmayır isti başı...
Yol üstündə duran gənclər bu dilbərə baxar keçər
Qızın oynaq baxışları şimşək kimi çaxar, keçər.
Oxucular, bu qızcığı bənzətməyin pozğuna siz,
Bəzən ona böhtan atır bizim yaman dillərimiz...
Acıyıram bu ceyrana... tez açılır könül bağı,
Bəzən onun yersiz gülüb, yersiz sözlər danışmağı
Şübhə salır ürəklərə, iştahlanır bir çoxları,
İncə xanım beyniqandır, sınamamış dostu, yarı.

İncə xanım, incə xanım, çox güvənmə gözəlliyə
Çox inanma qüdrətinə, “bu dünyada mənəm!” – deyə.
Vəfasızdır “gözəlliyin” gəlib keçən xoş günləri.
Bir çoxları deyir sənə “nazlı mələk, nazlı pəri”.
İnanma gəl bu uydurma, bu pərdəli sözlərə sən,
Bu dünyada çox danışar hər atını sürüb gedən.
Gələcəkdir bir zaman ki, solacaqdır yanaqların,
Bil ki, o vaxt soyuyacaq sənin isti dodaqların.
Ağaracaq saçların da, qaydasıdır təbiətin...
Külək vurmuş ağac kimi bükülləcək bu qamətin.
Bil ki, sənə “buyur!” – deyə bu gün “hörmət” göstərənlər,
İndi sənə çiçək verib yanağından gül dərənlər
O vaxt gəlib keçəcəkdir hüzurundan saymazyana,
Mənim borcum bu oldu ki, gələcəyi deyim sana.

İncə xanım, nə gözəldir, nə incədir sənin səsin,
Düşündürür qəlbi bəzən xoş avazın, xoş nəfəsin.
Gözlərində xumarlanır Qarabağın mənzərəsi,
Dodağından süzüldükcə o dağların şikəstəsi.
Mənim könlüm qanad çalır eldən gələn bu sənətə,
Gözəlliyin qədrini bil! Hörmət olsun təbiətə!
Bil ki, mənim vəzifəmdir baxıb sənə deyim yenə,
Nə bədbəxtdir göz yumanlar təbiətin vergisinə.
Budur bizim səhnəmizdə aşıq gəzir saz görünür,
Ancaq, gözəl səhnəmizdə gözəl qızlar az görünür.
Buyur, sənin meydanındır, orda göstər hünərini
Oxu “bizim ellər” – deyə dolğun könül dəftərini!
Biz də səni dinləyərək alqışlayaq, alqışlayaq,
“Bir də! Bir də!” – Çağıraraq, sənə güllər bağışlayaq.

*1938, 24 fevral*

## AZƏRBAYCAN

Dostlar! Gəlin sizə bir-bir danışım
Min bağın, bağçanın barı məndədir.
Sinəm oylağıdır gözəlliklərin
Hər sevən ürəyin yarı məndədir.

Nə çoxdur qoynumda almalı bağlar!
Qüdrətim göylərin dilini bağlar.
Meşəli dərələr sal buzlu dağlar
Dağların süd kimi qarı məndədir.

İnsan bir uşaqdır, vətən bir ana
Ömür bir çıraqdır, könül pərvana.
Yolunuz düşdümü bizim Şirvana?
Gül açan heyvası, narı məndədir.

İgidlər yurdudur, bu dağ, bu aran
Bu dağlar başında qalmamış boran.
Hər təzə çiçəkdən bir şirə soran
Pətəyə bal düzən arı məndədir.

***

Çoxdur düzlərimdə otlar, yarpızlar
Körpə şamamalar, iri qarpızlar.
Bulaq başındakı oğlanlar, qızlar
Elin kamançası, tarı məndədir.

Ağdaşın pambığı çiçək-çiçəkdir
Şəkinin bəzəyi şaldır, ipəkdir.
Qarabağ gözəli dünyada təkdir
İsti yanaqların narı məndədir.

Ölsün bu yerlərdən ilham almayan
Qəlbini saz kimi tutub çalmayan.
Yarışda gənclikdən geri qalmayan
Min qoca məndədir, qarı məndədir.

Şirindir insanın öz azadlığı
Könül azadlığı, göz azadlığı,
Qələm azadlığı, söz azadlığı
Dünyanın ən böyük varı məndədir.

Gəldi ömrün gözəl bahar çağları
Açılmışdır könüllərin bağları.
Qarış-qarış dolan bizim dağları
Diş göynədən bulaqları məndədir.

Bu yerlərin hər torpağı, hər daşı
Yaranmışdır ayın, günün sirdaşı.
Əyilməmiş bu dağların dik başı
Koroğlunun mərd vüqarı məndədir.

Ləkə yoxdur mənim bu ağ üzümdə
Ceyran qaçar, cüyür mələr düzümdə.
Bağlarımda gilas da var, üzüm də
Min çiçəyin çəmənzarı məndədir.

Hər budaqda bir bülbülə yuvam var,
Ağır elli oymağım var, obam var,
Xəstələrə dərman verən havam var,
Səhərlərin xoş ruzgarı məndədir.

Sarı limon çay üstündə dad olur,
Gözüm görür, könlüm evi şad olur,
Hansı namərd dost evinə yad olur?
Məhəbbətin vəfadarı məndədir.

Dil açmışdır bu sədəfli sazlarım
Mahnı qoşur gözəl-göyçək, qızlarım.
Göllərimdə alaboğaz qazlarım
Durnaların düz qatarı məndədir.

Ölüb getdi günlərimi saymağım,
Dildən-dilə dastan oldu oymağım,

Təmiz südüm, şəkər kimi qaymağım,
Dövlətimin ixtiyarı məndədir.

Yaz gələndə qışın ömrü pozular,
Dağ döşünə seyrə çıxar quzular,
Hələ dayan! Şairin çox sözü var,
Ana yurdun sənətkarı məndədir.

Buruqlarım nərə çəkmiş çöllərə,
Ayılmışdır yuxusundan dağ, dərə.
Alqış! Bizim bol işıqlı ellərə,
İnsanların bəxtiyarı məndədir.

Axşam üstü Bakıya bax doyunca,
Ulduzlarım yanır sahil boyunca.
Dağ üstündə o qərənfil, o yonca
Vətənimin laləzarı məndədir.

Nə zindan var, nə yumruq var, nə də din
Könlüm quşu! Bir də dillən, bir də din,
Nizaminin, Füzulinin, Vaqifin
Gözəl-gözəl yadigarı məndədir.

Mən xoşbəxtəm azadlığım gələli,
Tarix yazır ellərimin öz əli,
Bayrağımdır qızıl Şərqin gözəli
Azadlığın düz qərarı məndədir.

Sinəm oldu bir yıxılmaz söz dağı
Bir də ellər görməyəcək göz dağı.
Vətənimin günəş üzlü bayrağı
Yer üzünün bayraqdarı məndədir.

Vurğun deyər ellə çıxdım qəfəsdən
Doymamışam bu nəğmədən, bu səsdən
Min il keçsə könlüm düşməz həvəsdən
Şerimizin ilk baharı məndədir.

*1938, 8 iyun*

## ŞADLIQ

Bu gün qonaq düşdüm Kükəl kəndinə,
Könlümün bülbülü dil açdı yenə.
Üzümə güldükcə hər gül, hər çiçək,
Ucaldı dağ kimi sinəmdə ürək.
Bilirəm ellərin düz vəfası var,
Burda keçən ömrün min səfası var.
Qəlbə mehribandır bu daş, bu torpaq,
Bülbüllər yuvası hər yaşıl yarpaq.
Çiçəklər içində gülür yamaclar,
Göylərə baş vurur hündür ağaclar.
Bu yerdə hər quşun bir nəvası var,
Səhərin, axşamın öz havası var.
Çayların üstündə süzür sonalar,
Qəfəsdən çıxmışdır bizim analar.
Məni qarşılayır bu azad ellər,
Bizim mərd ürəkli qəlbi şad ellər.
Bu açıq alınlar, gülər baxışlar,
Bu saysız "ura"lar, sonsuz alqışlar
Mənə mehribandır öz anam qədər;
Hələ yazılmamış böylə bir əsər.
Hələ divarlara, ağaclara bax,
Asılmış hər yerdən bizim al bayraq.
Bəzəmiş yolları xalı-xalçalar,
Kəndistan yerinin öz rəssamı var.
Bayram içindədir nazlı kəndimiz,
Bizim bu söhbətli, sazlı kəndimiz.
Qoruyaq bağları düşmən küləkdən...
Ellər yaxşı bilir deməsəm də mən.
Bu xoşbəxt kəndimiz görüm var olsun,
Düşmənin başına dünya dar olsun!
Qardaşlar! Bacılar! Sizinləyəm mən,
Duz-çörək almışam dost əlinizdən.
Mən ki, çox razıyam doğma elimdən,
Bu ad düşməyəcək mənim dilimdən.

*1938, 19 iyun*

# BİZİM GƏNCLİYƏ

Bizim gənclik bəsləmişdir, böyütmüşdür aslanları,
Bu gəncliyin gözlərindən oxuyuruq ilk baharı:
Bu gün könlüm dərdə düşdü, könül dedi: noldu şair,
Qurtarmadı gəncliyimin qəhrəmanlıq dastanları?

Bu gəncliyin ağ alnında açılmışdır ay qabağı,
Bu gəncliyin əlləriylə qurulmuşdur sənət bağı;
Nə xoşbəxtdir vətən oğlu, nə xoşbəxtdir vətən qızı,
Bu gəncliyin sinəsinə çəkilməmiş hicran dağı...

Salam sizə azad eşqin, azad qəlbin yolçuları.
Məhəbbətdir bu dünyanın tükənilməz böyük varı,
Sevin, gülün, xoşbəxt olun diləyimdir gözəl dostlar! –
Mən də yazım dəftərimə eşqə sadiq olanları.

Mən qəlbimlə, ilhamımla öpməkdəyəm bu gün sizi,
Əzbər deyin şerimizi, təmiz bilin dilimizi.
Bizim gənclik qaldıracaq ulduzların qucağına
"Vaqif"lərə ilham vermiş şeir, sənət elimizi.

İndi mənim bir sözüm var kəndimizin qızlarına,
Ceyran çıxar dəstə-dəstə bizim Muğan düzlərinə;
Böyük rəssam təbiətdir, o çəkmişdir sürməsini
Bizim durna gözəllərin qaşlarına, gözlərinə.

Mən gözəllik aşiqiyəm yarandığım gündən bəri,
Bizim qızlar nə mələkdir, nə huridir, nə də pəri.
Onlar geyib bəzənəndə, kəklik kimi gülüşəndə,
Söhbət açır, saza tutur bizim gözəl məclisləri.

Bizim böyük dünyamız da gözəlliklər dünyasıdır,
Hər könülün sığıncağı bir məhəbbət dəryasıdır.
Daşa dönsün bu dünyada məhəbbəti ucuz tutan,
Mən təzədən yazacağam hələ bunlar harasıdır!

Bizim qızlar sığal versin lalə rəngli yanaqlara,
Qoy oxşasın ağ bənizlər quzeydəki təmiz qara.

Sən ey şair ilhamımın ilk anası, ilk bacısı,
Səhər-səhər bax günəşə, saçlarını təmiz dara!

Sən ey insan qüdrətinin ilk beşiyi böyük ana!
Pərvanələr dolanmışdır ətrafına yana-yana.
Qoy düşməsin əllərindən o kitablar, o dəftərlər,
Taleyimiz, tərbiyəmiz tapşırılır bu gün sana.

Elmin gücü yol açmışdır kilidlənmiş dənizlərə,
Mədəniyyət işıq verdi sarı solğun bənizlərə.
İnsan oğlu öz elmilə səmaları seyr edəcək,
Göydə yanan ulduzları çiçək kimi dərə-dərə.

Lakin elmin bacısı var – o da təmiz bir ürəkdir,
Saf ürəkli insanlardan tarix xeyir görəcəkdir.
Biz qururuq, yaradırıq bu sədaqət dünyasını.
Bizim gənclik nə büsatlar nə dövranlar sürəcəkdir...

İnsan oğlu unutmamış düz salamı, düz ilqarı;
Deyən qalmış orda-burda yenə vicdan oğruları.
Onlar elin əllərilə qulağından mıxlanacaq,
Müqəddəsdir əzəl gündən elin haqqı, elin varı.

Əziz tutaq, yaxşı bilək yoldaşlığın qədrini biz,
Can yandıraq bu dostluğa, qardaşlığa hər birimiz.
Qoy utansın dünyamızdan hünərsizlər, dar gözlülər.
Qəhrəmanlar ömür sürər qəlbi təmiz, hissi təmiz.

Ürək təmiz olmalıdır bulaqların suyu kimi,
Bəzisinin vicdanısa qaranlıqdır quyu kimi.
Bu dünyadan payı yoxdur bu qeyrətsiz paxılların,
Ömrü günü gəlib keçir tox qarına yuxu kimi.

Bir çoxu da ömrü boyu başqasına böhtan atar,
Şöhrət üçün, mənsəb üçün, vicdan alıb vicdan satar.
Lakin hünər meydanında, salağanta başı batmış,
Kötrüm düşən öküz kimi samanlıqda yeyib yatar.

Boz qarğalar qarışmasın bülbüllərin xoş səsinə,
Bizim gənclik yaranmışdır qəhrəmanlıq həvəsinə.
Qoy anlasın birdəfəlik lağlağılar, boşboğazlar;
Yalnız hünər yaraşmışdır bizim Odlar ölkəsinə.

Qoy var olsun bu dövranlar, bu dil açıb ötən sazlar,
Bülbülləri cəh-cəh vuran bu çiçəkli güllü yazlar.
Zaman keçir, həyat gülür, uşaqlar da alim olur,
Daha bəsdir, adam olsun xeyrə-şərə yaramazlar.

Yoxsa gedir karvanımız aya sarı, günə sarı,
Tarix durub gözləməyir öz yerində sayanları.
İlham bizim, sevgi bizim, Vətən bizim, hünər bizim,
Qoy var olsun bizim gənclik, bu gəncliyin ilk baharı.

*1939, fevral*

## XƏYAL

Bir axşam dırmandım bir dağ başına,
Vuruldum dünyanın bahar yaşına.
Çəmən xalısını sərmişdi döşə,
Seyrəngah olmuşdu nazlı günəşə.
Görürdüm o dağda ayaq izləri...
Dünya qurğusunu qurandan bəri
Min rəngə düşmüşdü hər ot, hər çiçək.
İlham deyirdi ki, gəl bir də keçək
Bu ceyran talası, xəlvət dərədən,
Bir dastan yaradaq bu mənzərədən

Ah, gözəl təbiət! Mehriban ana!
Əzəldən bağlıdır varlığım sana.
Səndə gözəllərin ilk andı vardır,
Nə alnın qırışıq, nə qəlbin dardır...
Al məni, yenə al qoynuna bu gün,
Dola qollarımı boynuna bu gün.
Bir öpüm doyunca o saf üzündən,
Keçim xəyalımın ceyran düzündən.
Mən bu düşüncəylə gəzirdim dağı,
Yanımca gedirdi təbin ayağı...
Bu zaman bir bulud qalxdı üfüqdən,
Gördüm xəyalımı o buludda mən.
O uçdu... uçduqca yüksəldi yenə,
Yol aldı göylərin dərinliyinə...
O, göylər mülkünü salama gəldi,
Getdikcə incəldi... Yenə incəldi.
Sonra nöqtə kimi bulud daraldı,
Gözümdən yox oldu, hava qaraldı.
Mən bir də görmədim, görmədim onu,
Dedim ki, varmıdır xəyalın sonu?

*1939, 12 avqust*

## QIZCIĞAZ

Alagöz, sarışın körpəcə bir qız
Dörd divar içində ağlayır yalqız.
Gözünü sıxdıqca o gözəl pəri
Göyləri andırır ala gözləri.
Ah! O körpəciyin nə dərdi vardır?
Onu da ağladan bir intizardır...
Alıb gəzdirsə də qızı qonşular, –
Ana nəfəsinin özgə dadı var...
Ağlayır, ağlayır bala qızcığaz,
Qırılır qəlbində sədəfli bir saz.
– Anam gələcəkmi xəstəxanadan? –
Körpə bu sözləri dediyi zaman
İslanır kirpiyi yaşlar içində,
O yatır torpaqlar, daşlar içində...

Qucağında çağa görünür ana,
Zəif addımlarla çıxır eyvana.
– Alagöz, Alagöz! Bir oyan, qızım,
Sənsən bu dünyada tale yıldızım...
Qızcığaz gözünü yuxudan açır,
Ana o gözlərə bir şəfəq saçır.
– Can ana! Sənsənmi? Hardaydın, ana?
– Qızım, bir qardaş da doğmuşam sana!..

*1939, 14 avqust*

## NİZAMİ

Yoğruldu bütün varlığın ümmidlə hünərdən,
Şimşək kimi keçdikcə qaranlıq gecələrdən,
Hər kəlməni, hər şerini bir top kimi atdın,
Sevda yuxusundan bizi vaxtında oyatdın.
Xoş gəldin əzizim, gəlişindən ana yurdu
Dünya evinə bir yeni söz məclisi qurdu...
Keçdikcə nəsillər o sənin söz çəmənindən,
Ellər, obalar dərs alacaqdır hələ səndən.
Ölməz bu gözəl aləmə idrakla gələnlər,
Məna evinin sirrini vicdanla bilənlər.
Sənsən əbədiyyət dediyim sevgili dildar,
Daşlarda, çiçəklərdə, ürəklərdə adın var.
Aydanmı günəşdənmi yarandın, de, nədən sən?
Xalqın gözü də, qəlbi da, vicdanı da sənsən.

*1939, 24 avqust*

## FİTNƏ

“Eh... ölüb getmədi bircə bu qarı,
Torpaq da sevməyir bu çal kaftarı...
Qurdla qiyamətə qalacaq deyən;
On ildir bu evin gəliniyəm mən,
Yediyim, içdiyim bir qan oldu, qan,
Nələr çəkməmişəm bu qaynanadan!
Bir ölüb getsəydi azad olardım,
Mağıl adam olub ətə dolardım.
Açardım tələsik o sandıqları,
Ordadır qarının toyluq paltarı.
İpəkdən, qumaşdan saxlancı vardır,
Deyir toy günündən bir yadigardır...
Bircə bu ağbirçək ölsəydi barı,
Alıb tikdirərdim o parçaları.
Hələ həmayili, saatı da var,
On ildir yanıram, ölməyir kaftar”.

Bu zaman yuxudan ayılır qarı,
Qırılır qəlbinin şah damarları:
– Qızım! Ağrın alım, uzandı səfər...
Arifdən gəlmədi yenə bir xəbər.
Bir dur şəhərə çıx, gör nə var, nə yox!
– Yaxşı, ər mənimdir, mırıldama çox!
Onsuz baxmayıram öz canıma da,
Gecə buz bağlamış yorğanıma da.
Sən nəyin dərdini çəkirsən belə?..
– Qızım nə deyirsən, bir insaf elə,
O mənim oğlumdur, anasıyam mən,
Ona süd vermişəm bu döşlərimdən.
Gözümün yuxusu çəkilir onsuz,
Oğul anasıyam, deyiləm sonsuz!
– Yaxşı, evdə otur, evi gözlə sən,
Gedib xəbər alım qulluq yerindən.
– Get, get, ağrın alım! Qarıyın qoşa,

Min dövranla vurun dünyanı başa...
Gəlin çıxır evdən... Qarısa təkdir,
Gözləri dolğundur, qəlbi kövrəkdir.
Ürəyi axşamdan dərdə tutulmuş,
Elə bil çırpınır qəfəsdə bir quş.
“Bəlkə bir xata var onun başında?
Ay allah, onu sən bu gənc yaşında
Saxla müsibətin yaman üzündən”.
Getdikcə qarının dolğun gözündən
Axır göz yaşları, axır sel kimi,
Ana ağlayanda ağlar el kimi.
Gəlin tez qayıdır bir qışqırıqla,
Yalandan ağlayır o hıçqırıqla: –
“Ah, ana! Arifin ölüm xəbəri...”
Yumulur ananın yaşlı gözləri,
Zəif ürəkciyi birdən sıxılır,
Dizləri titrəyib yerə yıxılır,
Rəngi bomboz olub torpağa dönür,
Zəif bir şam kimi keçinib sönür...

*1939, 24 avqust*

## ÜRƏYİ XAİN ADAM

Sənin soyuq baxışında nə həyat var, nə duyğu.
Donub qalmış sifətində qarlı bir qış soyuğu.
Açılmamış boğuq rəngin gülər üzlü baharda,
Elə bil ki, gəmin batıb qərq olmuşdur sularda.
Bir açılsın qaş-qabağın, üzə şax bax bir kərə,
Qayda budur: mil salınar əyri baxan gözlərə.
Yoxsa sənin murdar ömrün qaranlıqda keçəcək?
Aydınlığın bulağından mərd oğullar içəcək.
Qaradinməz, yerəbaxan şad xəbərə küsənsən,
Yüz il belə yaşasan da dünəndən ölmüsən sən!

*1939, 5 sentyabr*

## LƏZGİ QIZI

Ətəyini çirməyərək
Samur çaydan keçəndə sən,
Xəfif-xəfif əsən külək
Öpdü sənin gül üzündən...

Könül dedi: dayan bir az,
O dilbərin seyrinə dal;
Dedim tora yaxın durmaz
Ovçu görmüş ürkək maral.

Açdı xəyal yelkənini
Samur çayın baş bəndinə,
Ürək dedi: bağla məni
O gözlərin kəməndinə.

Gəlib çıxdın sən sahilə,
Ayağını öpdü çəmən.
Nə mən gəldim, nə sən dilə,
Bu da keçdi ömrümüzdən...

Sən ömrünün gənc yaşında
Addımını saya-saya
Gəlib keçdin dağ başında
Tüstülənən bir komaya.

Ürək qaldı yana-yana,
İlk görüşdən ayrıldıq biz, –
Sən o yana, mən bu yana.
Qaldı ayaq izlərimiz...

*1939, 28 oktyabr*

## SƏN UTAN!

Sən utan ! Bəllidir riyakarlığın!
Fitnədən yoğrulmuş bütün varlığın.
Dünyada mərdliklə dolanmışam mən,
Sənsən aralıqda min söz gəzdirən...
Sənsən asta-asta hiylələr quran,
Vəzifə başında yeyib quduran.
Gözün götürməyir mənim adımı,
Bu ad çoxlarına söz olmadımı?
Ömründə üz-üzə durmusanmı sən?
Sənsən papağının altda düşünən.
Atılma meydana, saxta pəhlivan,
Sənin də tükünü didəcək zaman!
Deyirlər sən də bir kişisən gerçək,
Əlindən gələni iki qaba çək.
Min su yeritsən də saman altından,
İgid baş verər ki, düşməz atından!

*1939, 1 noyabr*

## SAMUR ÇAYI

Bizim Qafqaz dağlarından şırıl-şırıl süzülən,
Çəmənlərin gərdəninə inci kimi düzülən,
Uca dağlar camalına güzgü tutan bu çayın,
Sağlığına saz tutaraq söz deyirəm bu gün mən

Hansı könül ilham almaz bu mənalı gözəldən?
Bir tamaşa yaranmışdır onun hüsnü əzəldən.
Bu gün mənəm Samurçayın sahilində dayanıb,
Xəyalımın dünyasında söz dastanı düzəldən.

Mən bilirəm bu çöllərin güzgü kimi üzü var,
Çaylarının hər daşında at nalının izi var.
Dağ başında tüstülənən qəhrəmanlar yurdudur,
Hər ananın ürəyində bir dünyanın sözü var.

Samur çayın dörd tərəfi bəzəkli bir gül bağı,
Ceyranların, turacların, kəkliklərin ovlağı.
Nədir o dağ döşündəki cərgələnmiş alaçıq?
Kiçik Qafqaz dağlarıdır, ləzgilərin yaylağı.

Samur çayı, sən axdıqca susuz yanan çöllərə,
Dalğaların baş əydikcə bizim ağır ellərə,
Boz təpələr çiçəklənir, atlas geyir yamaclar,
Bu şöhrətin dastan olur, ağızlara, dillərə.

Sən bəzəkli gəlin kimi, nazlı-nazlı keçəndə,
Susuz çöllər şadlanacaq şərbətindən içəndə.
Al qumaşa bürünəcək ana yurdun qızları,
Güllərindən dəstə tutub, sünbülünü biçəndə.

Samur çayı, gözlədiyin gün tezliklə gələcək,
Hər ağacın kölgəsində bir gözəl dincələcək.
Dilimizdə qəlbimizin ürək açan nəğməsi,
Səsimizdən yer tərpənib, ağır göylər güləcək.

Qızıl alma sallanacaq yaşıl donlu budaqdan,
Yasəmənin ağ bənizi, göz qırpacaq uzaqdan.
Bu gözəllik dünyasının şairanə seyrinə,
Hər insanın öz ürəyi çıxacaqdır otaqdan.

Bollanacaq yurdumuzun bağçaları, bağları,
Sarmaşacaq bostandakı şamamanın tağları.
Səhər-səhər bağ içində qoşa gəzən gənclərə:
– Gəl üzümdən öp – deyəcək ömrün gözəl çağları.

Boz çöllərin ciyərinə işlədikcə axar su,
Yayılacaq reyhanların, nanələrin qoxusu.
İnsan oğlu öyünəcək göstərdiyi hünərlə,
Təbiətin gözlərindən çəkiləcək yuxusu.

Sahilində çimişəcək yaşılbaşlı sonalar,
Qapısında gül görəcək ömrü keçmiş analar.
Samur çayı əks edəcək elektrik işığı,
Durna kimi düzüləcək aynabəndli binalar.

Dolanacaq Abşerona Samurçayın kəməri,
Al yaşıla bürünəcək bizim Bakı şəhəri.
İlk səhərin şəfəqiylə yuyunacaq səhralar,
Qızıl güllər qoxuyacaq ana yurdun səhəri.

Gözəl Bakı! Gözəl şəhər! Sən ey ana torpağı,
Pəncərəndən sallanacaq çinarların yarpağı.
Bülbüllərə dil verəcək, tutilərə kamança,
Qucağında bəslədiyin sənət bağı, söz bağı!

Hər meydançan olacaqdır yeniyetmə gülüstan,
Qalmayacaq təbiətdən zövq almayan bir insan.
Yaşıllıqda boy atacaq Nizaminin heykəli,
Tarixlərə səs salacaq qızıl xətli bu dastan.

Ayna sular hər qapıdan şırıl-şırıl axacaq,
Bizim qızlar sinəsinə qızıl güllər taxacaq.
Axşam üstü kölgə salan sarmaşıqlar içindən
Bu eyvandan o eyvana nə cananlar baxacaq.

Güldən biçsin öz donunu qoy Abşeron adası,
Qucaqlasın bu gülşəni biz Xəzər dəryası.
Gündən-günə şəfəqlənib işıq saçsın aləmə.
Bu azadlıq, bu səadət, bu gözəllik dünyası.

*1939, 3 noyabr*

## BİR SƏS...

Qərib bir səs gəldi bu gün qəlbimdən:
Ömrün baharında öləcəyəm mən...
Didib parçaladı bağrımı bu qəm,
Üzümə boylandı əlimdə qələm!
Of... Bu səs! Nə qədər ömrümə yaddır.
Mənim ki, gəncliyim qəmdən azaddır!
Qayadanmı qopdu bu daş qəlbli səs?
Həyat öz oğlunu vaxtsız itirməz!
Dağılın başımdan qara xəyallar,
Hələ arzularım, əməllərim var.
Qapımdan getməmiş ömrün ayağı,
Dövran mənzilimə dost gələcəkdir.
Bu Odlar yurdunun şeir bayrağı
Mənim sənətimlə yüksələcəkdir.

*1940, 27 yanvar*

## 20 BAHAR

“Açılmış fikrimin azad yelkəni,
Tarix öz qoynunda isidir məni.
Min illik bir ömür seyr etsə azdır
Bu azad torpağı azad ölkəni”.

### PROLOQ

Ulduzlar sayrışır mavi göylərdə,
İnsanlar çalışır, yaradır yerdə.
Yerdəki hər soyuq daş parçasından
Bir saray yaradır sənətkar insan.
Təbiət bizimlə durub diz-dizə,
Başından keçəni danışır bizə.
Onun da dərdini yazır sənətkar,
Dünyanın nə uzun macərası var.

Əzəldən böyükdür insanın adı,
Yorulmaq bilməmiş əqlin qanadı.
Gör insan əlinin nə qüdrəti var,
Dönür gülşən olur min xarabazar.
Sinədə gizlənmiş əl boyda ürək
Göylərin bağrına nərə çəkərək.
Dumandan sıyrılıb, buludlar aşır;
Doğrudan, insana hünər yaraşır.
İnsandır zövq alar axar sulardan,
Əlilə qurduğu min bir bahardan.
Kim bunu bilməyir deməsəm də mən?
Bu gözəl aləmin hər nemətindən
Başqa bir zövq alır düşünən insan;
Ürək zövq almasa yaratdığından
Ümid çırağının şöləsi sönər,
Xəyalın səhəri zülmətə dönər.

## *I simfoniya*

Bakı, pəncərəsi açıq bir bina
Xəzər dəryasını basmış bağrına.
Al geyib qızarır yenə üfüqlər,
Bir azdan gözünü açacaq səhər.
Gəlir qonşuluqdan piano səsi,
Qəlbə qanad verir onun nəğməsi.
Dağıtmış yuxumu yenə gözümdən,
Əzəldən nəğmələr aşiqiyəm mən.
Piano önündə gözəl bir pəri,
Xəyala getmişdir onun gözləri.
Sakit baxışları xumar-xumardır,
Hər duyan ürəyin bir eşqi vardır...
O gözəl dilbərə ad verək: Bahar –
Keçmişdir ömründən iyirmi bahar.
Onun vicdanında yoxdur bir ləkə,
Güvənir eşqinə əziz bir ölkə.
Piano üstündə göyərçin əllər
Gəzdikcə danışır şirmayı dillər.
Bahar öz ömründən gül dərə-dərə,
Bir bayram töhfəsi yazır ellərə:
“Yaz gününün səfası var,
      Şırıl-şırıl axan sular
            Gülür bizə;
Qəlbimizə
İlham verir bu ilk bahar.
Bu dünyadan şadlıq apar.
Bayrağını çəkmiş səhər –
Gəl səhərin gülünü dər.
Bizim eldə,
Bizim dildə
Bir məsəl var, bilsən əgər:
“Zər qədrini zərgər bilər!”
Gül açmışdır səhər çağı
Qadınlığın gül yanağı.

Bu bağa gəl –
Ovlağa gəl!
"Açıldıqca könlüm bağı
Söndü ömrün qəm çırağı...

Yarandığı gündən bəri
Hər xəyalın şah əsəri
Qanadlıdır,
Nə dadlıdır
Ana yurdun nəğmələri"
Belə yazır gözəl pəri...

Ağlatmayır insanları
Leyli-Məcnun dastanları.
Məcnun gəzmir dağı, düzü –
Məhəbbətin güldü üzü...
Sevdaya bax!
Alqışlayaq
Bu bəxtəvər ömrümüzü,
Hörmətdədir sözün düzü...

Xəbər aldım Nizamidən,
Deyir: "Xoşbəxt oldu Vətən,
Öz sevgilim –
Ana dilim
Can qurtardı yad əllərdən –
Təzə gəldim dünyaya mən!"
Ana yurdun qız-gəlini
Vaqifin də heykəlini
Ürəyində,
Diləyində
Qaldırmışdır bir dağ kimi,
Yandırmışdır çıraq kimi.

Sənət ömrün ilk bağıdır,
Gözəl şeir qəm dağıdır...

Şahidik biz –
Vətənimiz
Məhəbbətin qucağıdır,
Şeir, sənət ocağıdır.
Şirmayı dillərdə süzür barmaqlar,
“Səadət nəğməsi” yaradır Bahar.
Musiqi can verir ruha əzəldən,
Musiqi qəlb alır min bir gözəldən.
Xəyalı oxşayan hər təranəsi
Bir şair qəlbidir, bir canan səsi.
Hər incə pərdənin öz aləmi var,
Bəzən nəşəsi var, bəzən qəmi var.
Musiqi daşları gətirir dilə,
Ram olur səsinə vəhşilər belə...
Bu gün də zövq alır hər duyan insan
Böyük Bethovenin simfonyasından.
O bəzən düşünür dəniz kimi lal,
Onun sahilinə çatmayır xəyal.
Bəzən də əsdikcə könül ruzgarı,
Coşur xəyalının şah dalğaları.
O gözəl sənəti dinlədikcə biz
Hörmətlə çırpınır ürəklərimiz.

Çal, gözəl Baharım! Bahar çağıdır,
Bülbülün vətəni ellər bağıdır.
Çal ki, ayaqlarım yerdən üzülsün,
Yarpaqlar danışıb, çiçəklər gülsün.
Çaldığın havalar bizə həmdəmdir,
Çaldığın nə hicran, nə də ki, qəmdir.
Sən azad bir elin azad qızısan,
Sən həyat aşiqi, həyat qızısan.
Gəncliyin dolmuşdur iyirmi yaşa
“Gərdənin minadır, boyun tamaşa”.
Başla musiqiylə bizim bayramı,
Əlində yaylığı oynasın hamı.

## *II simfoniya*

Eşit bu nəğməmi, Təbriz gözəli,
Adındır eşqimin ilki, əzəli.
O qəmli gözlərin intizardadır,
Xəyalın qəfəsdə ömrün dardadır
O gün ki, parladı şahların tacı,
Sən oldun bir çörək, bir haqq möhtacı.
Yeyildi varlığın çeynəndi ömrün;
Ömründə şadlanıb gülmədim bir gün.
Füzuli şerində adın var sənin,
Qüssədir ovlağın qəmdir vətənin
Pərişan saçların nə tarımardır...
Ruhunda ağlayan bir neymi vardır?
Bizim ki, atamız, anamız birdir,
Qəlbimiz, eşqimiz ayrı deyildir.
Mən azad olmuşam, adım da Bahar,
Səninsə qəlbində bülbüllər ağlar!

Düşdü qılınc kimi ortadan Araz...
Fəqət, yaman günün ömrü çox olmaz.

Ah, bacım! Ürəyin çəkildi dara!..
Təpədən-dırnağa geyindin qara...
Döyünən qəlbinə köksün dar oldu,
Yediyin, içdiyin zəhrimar oldu.
Ağ sinən üstündə od qalandıqca,
Eşqin, məhəbbətin tapdalandıqca,
"Möhnət çəmənindən gül dərə-dərə".
Ucaldı şairin ahı göylərə:
"Şəbi-hicran yanar canım,
Tökər qan çeşmi-giryanım;
Oyadar xəlqi əfqanım,
Qara bəxtim oyanmazmı?"

***

Füzuli yurdunun qəm səsidir bu,
Pərişan bir elin naləsidir bu.
Yox, yox, bu nalələr, bu acı qəmlər,
Çəkdiyin ağrılar, dərdlər, sitəmlər
Ağ gündən müjdələr vermədi sana,
Yatdığın yuxudan baş qaldırsana!

Dur, bacım! Haqqını sən özün istə,
Dur and iç Babəkin məzarı üstə,
Elləri bir yeni, ağ günə səslə,
Sarıl günəş rəngli bir al bayrağa,
Səsinlə elləri qaldır ayağa...
Azadlıq eşqiylə hayqırdıqca sən,
Ellər ilham alsın ana səsindən...
Yandır ürəyini zülmətə qarşı,
Atıl cəbhələrə aslanlar kimi.
Hünərlə atılır hər zülmün daşı,
Kükrəyib bağıran bir ruzgar kimi,
Çağır döyüşlərə öz sevgilini;
Öz ana qəlbini, ana dilini
O düşmən əllərdən özünə qaytar,
Qoy öpsün alnını gül üzlü bahar.

### *Əks-səda*

Axma, Araz! Dayan, Araz!
İnsaf eylə bizə bir az.
Bir ürəyi iki yerə
Cəllad kimi bölmək olmaz...

Azəridir mənim adım.
Bağlansa da qol-qanadım,
Dünya bilir şöhrətimi,
Mən ki, bir qul yaranmadım...

Yüz ildir ki, dustağam mən,
Qürbət olmuş mənə Vətən.
Min haqqımı çeynəmişdir
Hər tac qoyub yoldan ötən.

Təbriz oğlu! Təbriz qızı!
Yadlar yedi haqqınızı.
Bir üsyanla doğacaqdır
Azadlığın dan yıldızı!...

Babam kəndli, qarnı acdır,
Bir çörəyə o möhtacdır.
Gecə-gündüz çalışsaq da,
Qazancımız ehtiyacdır.

Sulu daxma... torpaq qara..
Çəkilmişdir ömür dara.
Dözə bilməz insan oğlu
Bu gönsoyan qanunlara.

Qara gəldi ruzgarımız,
Talan oldu hər varımız.
Yaz əkinçi, qış dilənçi,
Yenə boşdu anbarımız.

Vətən oğlu! Vətən qızı!
Yadlar yedi haqqınızı;
Bir üsyanla doğacaqdır
Azadlığın dan yıldızı!...

EPİLOQ

Günəş doğub səhər oldu,
Ay geyindi gözəl Bahar,
Düz iyirmi yaşa doldu
Ana yurda gələn bahar.

Gözəl Bakı başdan-başa
Bəzənmişdir al qumaşa.
Al bayraqlar eyvanlardan
Baş əymişdir yollar üstə.
Azad torpaq... azad insan
Gəlib keçir dəstə-dəstə.
Hər dodaqda bir gülüş var,
Hər baxışdan günəş parlar.
Əldə qarmon, sinədə tar –
Salamlayır yaz elləri.
Yallı gedir qatar-qatar
Ana yurdun gözəlləri.
Gözün aydın, gözəl Bakı,
Toy-bayramdır qoynundakı!..

Aç paradı, Qızıl Ordu!
Addımında əzəmət var.
Baxıb desin ana yurdu:
Bəslədiyim mərd oğullar
Ad qoymuşdur bu dünyada,
Ana südü getməz bada!
Qoy səsindən gülsün Vətən,
Ellər baxıb uğur desin;
Dağlar yaran mərd səsindən
Uzaq göylər cingildəsin.

*1940, 13 aprel*

## ALA GÖZLƏR

Yenə qılıncını çəkdi üstümə
Qurbanı olduğum o ala gözlər.
Yenə cəllad olub durdu qəsdimə
Qələm qaş altında piyalə gözlər.

Başımdan getmişdi sevdanın qəmi,
Xəyalım gəzirdi bütün aləmi.
Bu dustaq könlümü, deyin yenəmi
Çəkdiniz sorğuya, suala, gözlər?

Sevda yolçusuyam əzəl yaşımdan,
Könlüm ayrı gəzir can sirdaşımdan;
Dağıdır huşumu alır başımdan
Süzülüb gedəndə xəyala gözlər.

Gərdənin minadır, boyun tamaşa,
Ay da həsəd çəkir o qələm qaşa.
Bir cüt ulduz kimi verib baş-başa
Yanıb şölə salır, camala gözlər.

Mənim sevgilimdir o gözəl pəri,
Qoy üzə vurmasın keçən günləri.
Mən qədir bilənəm əzəldən bəri,
Sizinlə yetmişəm kamala gözlər.

Cahanda hər hökmü bir zaman verir,
Dünən dövran sürən bu gün can verir.
İllər xəstəsiyəm yaram qan verir,
Siz məni saldınız bu hala, gözlər.

*1940*

## TƏZƏ İL

Vaxtdır qədəhləri qaldırın dostlar!
İçək təzə ilin şərəfinə biz;
Al geyib gələcək yeni bir bahar,
Var olsun ömrümüz, səadətimiz,
İçək təzə ilin şərəfinə biz.

Həyat bir dastana bənzər əzəldən,
Oxunar aləmdə o varaq-varaq.
Daimi deyilik nə siz, nə də mən,
Bizdən bu dünyada hünər qalacaq, –
Oxunar aləmdə o varaq-varaq.

Gəlib dolansa da min bahar, min qış,
Yaşamaq eşqiylə çırpınır ürək!
Alqış, bu müqəddəs diləyə alqış!
İnsan əməlilə dövran sürəcək,
Yaşamaq eşqilə çırpınır ürək!

Keçdi gəncliyimdən otuz beş bahar;
Keçdiyim yollara baxdım bir daha.
Nə qədər az imiş məndən yadigar!..
Lakin öz qapımı açdım sabaha...
Keçdiyim yollara baxdım bir daha.

Gəl, gəl, gözəl sabah! Gözəl günəş gəl!
Sağımda, solumda qoşa dayanın.
Böyük bir aləmdir hər kiçik əməl...
Mənim bu eşqimlə qoşa da yanın,
Sağımda, solumda qoşa dayanın!

Sən ey xumar gözlü sevdalı səhər!
Səni də insanın eşqi yaşadır.
Ey bu gün dünyaya gələn körpələr,
Göz açın, yurdumuz nə tamaşadır,
Sizi də insanın eşqi yaşadır...

Əkiz yaranmayır sizinlə nə qəm,
Nə də ki, tarixin acı göz yaşı.
Səadət sizinlə başlanır desəm,

Doğrudur! Qalmamış nə zülmün daşı,
Nə də ki, tarixin acı göz yaşı.

Budur budaqdakı hər yaşıl yarpaq,
Tarixlər yaşamış bu qara torpaq,
Hər axar çeşməmin xoş zümzüməsi,
Bu şeir dünyası, bu sənət səsi,
Hər duyan ürəkdən qopan arzular,
İnsanlıq dediyim bu gözəl bahar,
Bu ana torpağı, bu ana Vətən,
Üstünə gün doğub küləklər əsən
Baş-başa çatılmış bu qoca dağlar,
Vüqarı qəlbim tək bu uca dağlar,
Şairə göz vuran hər çiçək, hər gül,
Öz yas köynəyini soyunmuş bülbül,
Dilsiz körpəsini basıb bağrına,
Şirin yuxu görən müqəddəs ana,
Bu şeir yurdunun böyük kəlamı,
Yurdunu seyr edən qoca Nizami,
Onun dalğalanan könül dənizi,
Leylinin təzədən gülən bənizi,
Fərhad külüngünün nişanələri,
Tarixin ən gözəl əfsanələri,
Bu köhnə dünyanın təzə mənası,
Ağ günlər əsrinin bu simfoniyası
Ömrü uzatdıqca dillənir varlıq,
Bizə nələr deyir bu bəxtiyarlıq?!
Deyir ki: – Dastandır həyat əzəldən,
Oxunur aləmdə o varaq-varaq,
Daimi deyilik nə siz, nə də mən.
Bizdən bu dünyada hünər qalacaq,
Oxunur aləmdə o varaq-varaq.

Vaxtdır qədəhləri qaldıraq, dostlar!
İçək təzə ilin şərəfinə biz!
Al geyib gələcək yeni bir bahar,
Var olsun ömrümüz, səadətimiz,
İçək təzə ilin şərəfinə biz.

*1940, 28 dekabr*

## ŞAM

O alışır hər axşam,
Düşünür tək, yanır tək...
Həsrətləmi yanır şam,
Göz yaşları tökərək?

Deyin, neçin o laldır,
Bu dilsizlik nədəndir?
Deyin bu nə sualdır,
Hansı bir sinədəndir.

Ah! Bu şamın ürəyi
Alışdıqca hər gecə
İnsan oğlu şam təki
Bəzən yanır gizlicə.

O gizlicə yanır ki,
Yerdən ucalsın bir az...
İnsanın dərdi var ki,
Onu açıb-ağartmaz.

*1941, 18 fevral*

# ANANIN ÖYÜDÜ

Geyib əsgər paltarını, silahlandı qəhrəman,
Onun polad sinəsinə sığışmadı ürəyi.
Dayan! – deyib, yaxın gəldi, öpdü onun alnından
Yay gününün xoş səhəri, bir də dağlar küləyi.
– Ana! Getdim, salamat qal! – deyib öpdü qarını,
Ana igid balasına açdı öz qollarını.
Üz-gözündən öpə-öpə bağrına basdı onu,
Ana yurdun bu qəhrəman, bu namuslu oğlunu.
Dedi: "oğlum, göz bəbəyim, sən ey ömür çiçəyim!
Tarixlərin şahididir mənim bu ağ birçəyim.
Görürəm ki, qəhrəmansan, sənə halaldır südüm,
Qulağında yaxşı qalsın mənim sənə öyüdüm:
Biz sənsiz də dolanarıq, uğur olsun yoluna,
Qılıncını çalan zaman qüvvət gəlsin qoluna!
Sən düşmənin qabağında igid tərpən vüqarla,
Tüfəngini təmiz saxla, atını da tumarla!
Öz yerində olsun gərək igidin yar-yarağı,
Hər gün yeni bir zəfərlə gəlsin onun sorağı.
İgid balam! Hərçəndi ki, öz ananam mən sənin,
Çörəyilə böyümüsən bizim ana Vətənin.
Bizim ellər Koroğlular, Xətailər yurdudur,
Hər nəfəri güllə batmaz, top dağıtmaz ordudur.
Payız vaxtı bağçamızın heyvaları dəyəndə,
Şaftalılar şirələnib budağını əyəndə,
Göndərərəm sovqatını – sənin də öz payını,
Sən də artır öz əlinlə zəfərlərin sayını.
Get, düşmənin qabağında igid tərpən vüqarla,
Tüfəngini təmiz saxla, atını da tumarla".
Əsgər artıq yola düşdü, dağ tərpəndi yerindən;
Günəş yaydı şöləsini Vətənin göylərindən.
Ana baxdı öz oğluna, su da səpdi dalınca...
Şair qəlbi bu səhnədən ilhamını alınca:
– Yaşa, – dedi, – ey qəhrəman! Yaşa, – dedi, – ey Vətən!
Sonra şair dodaqları öpdü ana əlindən.

*1941, 23 iyun*

## ŞƏFQƏT BACISI

Gəl, ana yurdumun qızı, gəlini,
İndi hünər vaxtı, qeyrət dəmidir.
Sən də əsirgəmə kömək əlini,
Hər sözün, söhbətin can məlhəmidir.
Adın şərəflidir sənin, ey qadın!
Dahilər anası çağrılır adın.

Əlinlə qurduğun barlı bağçalar
Tufanlar qopsa da saralıb-solmaz.
Bizim bu yerlərdə bir məsəl də var:
"Aslanın erkəyi, dişisi olmaz!"
Cəbhələr çağırır... Gəl düşək yola,
Zəfər bizimkidir, uğurlar ola!..

Əzəldən təmizdir, safdır ürəyin,
Bir də şairanə təbiətin var.
Həyat aşiqidir eşqin, diləyin,
Dildə dastan olan məhəbbətin var.
Var olsun cahanda eşqin, əməlin,
Var olsun daima yaradan əlin!

Gəl çıxaq cəbhəyə, əmr edir Vətən,
Sən də bu meydanda kükrəyib çağla!
Düşmənin gülləsi dəysə sinəmdən,
Mehriban əlinlə yaramı bağla.
Həyat verəcəkdir bizə dərmanın,
Əlinlə yazılsın hökmü zamanın.

Gəl, indi cəbhədə yoldaş olaq biz,
Bir cüt aslan kimi vuruşaq qoşa;
Zəfərlə qurtarsın mübarizəmiz,
Sonra öz evində bəxtiyar yaşa.
Vətənin gözləri indi bizdədir,
Azadlıq çırağı əlimizdədir!

Gəl, ay camalının saf şöləsindən
Bir də işıqlansın sinəmdə ürək.
Gəl, Vətən eşqinin yürüş səsindən
Sel kimi kükrəyib hücuma keçək,
Aşıb şiş dağları, meşəlikləri
Gündə bir zəfərlə gedək irəli.

Gəl Qızıl Orduya! Sarıl bu günə!
Parla yaz gününün səhəri kimi.
Tutum üzəngini, qalx at üstünə,
Sən Qaçaq Nəbinin Həcəri kimi.
Hücuma keçdikcə nərə çəkib sən,
Günəş nur tökəcək üstünə göydən.

Əlinlə qurduğun barlı bağçalar
Tufanlar qopsa da saralıb-solmaz.
Bizim bu yerlərdə bir məsəl də var:
“Aslanın erkəyi, dişisi olmaz!”
Cəbhələr çağırır... Gəl düşək yola,
Zəfər bizimkidir, uğurlar ola!..

*1941, 24 iyun*

# QIZIL ŞAHİNLƏR

Tərlan kimi qıy vuraraq buludlardan–buludlara,
Uçub gedir şahinlərim dumanları yara–yara.
Göyün qəlbi titrədikcə propellerin nərəsindən,
Ana torpaq qüvvət alır igidlərin mərd səsindən.
Açır qızıl şahinlərim göy üzündə qanadını,
Yazır mavi üfüqlərə ana yurdun mərd adını.
Qızıl pilot yaxşı bilir indi zaman nə zamandır,
İndi tarix göstərəcək hansı oğul qəhrəmandır.
Uçun, qızıl şahinlərim! Siz uçduqca hey ucalın,
Quzğunların qanadını bir vuruşda yerə salın!
Uçun, qızıl şahinlərim! Göylər olsun məskəniniz!
Arxanızca göz dikmişdir sizin böyük Vətəniniz.
Uçun düşmən torpağına, şəfəq kimi axın, keçin,
Buludlardan–buludlara şimşək kimi çaxın, keçin!
Qoy boğulsun göy üzündə düşmənlərin təyyarəsi,
Quduz dişli Hitlerin də öz içində batsın səsi.
Aslanların, pələnglərin ovlağıdır mənim yurdum,
Ana Vətən, döşlərindən süd əmmişdir Qızıl Ordum.
Gəlmə mənim göylərimə, qara bulud, çəkil geri!
Qaniçici faşistlərin məzarlıqdır yalnız yeri.
Yaxın gəlmə, qarı düşmən! Döyüşlərdə boy atdım mən,
Ayaq basma torpağıma, od parıldar nəfəsimdən.
Uçun, qızıl şahinlərim! Göylər olsun məskəniniz!
Arxanızca göz dikmişdir sizin böyük Vətəniniz!..

*1941, 25 iyun*

## QOCA QƏHRƏMANIN ÇIXIŞI

Bir şir kimi sinə gərdi o danışıq kürsüsünə,
Bütün salon qulaq asdı bu qocanın gur səsinə.
Dedi: "Yaşım ötsə belə, qulaq verin, söz mənimdir,
Könlüm kimi qocalmayan al bayraqlı Vətənimdir.
Deyirlər ki, casus girmiş Sovetlərin sərhəddinə,
Deyirlər ki, o quldurlar öz həddini azmış yenə.
Hər bir igid hazırlasın tüfəngini, yarağını,
Mən dünəndən, doldurmuşam patronumun darağını.
Görürsünüz tək əlliyəm, mənim bircə qolum vardır,
Bu, vətəndaş hərbindəki gəncliyimdən yadigardır.
Oğlum bu gün cəbhədədir nərə çəkir bir nər kimi,
Mənim gənclik illərimdə göstərdiyim hünər kimi.
Gözlərim də uzaq görür bir alıcı tərlan kimi,
Döyüşməyə qüdrətim var cəbhələrdə aslan kimi.
Yad əllərə vermərəm mən dəzgahımı, zindanımı,
Lazım gəlsə bu uğurda verəcəyəm öz qanımı.
Bir əllə də qılınc vurmaq mənim köhnə adətimdir,
Buna şahid, qocalsam da, bükülməyən qamətimdir".
O dedikcə bu sözləri od parladı gözlərindən,
Həyəcandan tutularaq, nəfəs aldı o dərindən.
Lakin onun ürəyini tamam dedi baxışları,
Var ol! – dedi bu qocaya izdihamın alqışları.
Divarları titrədirdi birdən qopan "ura!" səsi,
Nə gözəldir bu dünyada həqiqətin mənzərəsi.
Nə gözəldir igid ölmək, mərd yaşamaq bu dünyada.
Axar çaylar quruyaraq, dənizlər də getsə bada
Ölüb getməz tarixlərdən göstərilən böyük hünər,
O hünəri öz alnına ulduzlarla yazar göylər.

*1941, 26 iyun*

# BÜTÜN XALQLAR, QƏBİLƏLƏR OD İÇİNDƏN ÇIXACAQDIR

Avropanın küçələri qaranlıqdır yerdən göyə,
Aclıq yağır baxışlardan, insanların batmış ordu.
Qara geymiş başdan-başa polyakların ana yurdu,
Hitler ona kəfən biçir “Sənin haqqın budur!” – deyə;
Avropanın küçələri qaranlıqdır yerdən göyə.
Nə gündədir, görün polyak!
Sən zamanın hökmünə bax!
Fəqət tarix deyir bizə:
“İnsan bir qul olmayacaq!”
Çex də görür taleyini – vətənində qul olmuşdur,
Hər meydanda, meydançada dar ağacı qurulmuşdur.

Hitler özü avtorudur qaniçici fərmanların,
Qurşun tökür boğazına haqq danışan insanların.
Hər tərəfdə aclıq, ölüm...
Ərşə çıxmış yenə zülüm.
Yaman əsir Avropada ölümlərin pis ruzgarı;
Ot otlayır, sümük yeyir orda insan övladları.
Quşlar belə ürküb qaçır orda cəmdək qoxusundan,
Ac topların nərəsindən torpaq qalxır yuxusundan,
Döyür hər gün qapıları min ölümün qanlı əli,
Qıfıllanır hər könüldə insanlığın pak əməli.
Ayaqlarda tapdalanır hər igidin mərd vüqarı,
Təpiklərdə uçub gedir mədəniyyət sarayları.
İnsan ölür... ev bağlanır... tarla yanır... ocaq sönür,
Sıx meşələr od tutaraq, qayalıqlar külə dönür.
Yanğın qopur üfüqlərdə, dənizlərdə, adalarda,
Körpələrin meyidləri kabab olur cidalarda...
Yaxşı baxın, nəzər salın Bolqarıstan gözəlinə,
Azadlığın bayrağını o da almış öz əlinə.
Deyir: “Mənəm bolqar qızı, Bolqarıstan vətənimdir,
Mədən mənim, torpaq mənim, qüvvət mənim, söz mənimdir.
Mənim gözəl torpağıma qoy gəlməsin qəsbkarlar,

Hər ananın ürəyində min aslanın qüvvəti var"
Deyir: "Yaşıl tarlamızı düşmən əli qoy biçməsin,
Mənim axar çaylarımdan alman atı su içməsin!
Gəlin, – dedi bolqar qızı, – bir son qoyaq biz bu dərdə",
Odur, alman generalı murdar oldu təpiklərdə.
Qılınc taxıb, silah tutub, min qəzəblə gəldi hamı,
Axıb gəldi sellər kimi küçələrin izdihamı.
Ac qalanlar göstərərək öz əlinin qabarını,
Hər tərəfdən dağıtdılar bağlı taxıl anbarını;
O yandan da məqam güdür talan olmuş fransızlar,
Silah tutan mərd oğullar, dul gəlinlər, yaslı qızlar.
Öz kinini dişlərilə kilidləmiş böyük torpaq
Faşistlərin pəncəsində bir qul kimi qalmayacaq.
Marat qalxıb məzarından soran zaman: "Hanı vətən?"
Aslan kimi tərpənəcək hər fransız öz yerindən.
Yerin qəlbi titrədikcə gecə-gündüz top səsindən
Dənizlər də coşacaqdır igidlərin nərəsindən.
Al bayraqlı kommunarlar keçəcəkdir dəstə-dəstə,
Qadınlar da eyvanlardan gül səpəcək yollar üstə.
Demək, tarix əyə bilməz cəlladlara öz başını,
Qoca dünya tez qucaqlar öz ədalət qardaşını...

*1941, 29 iyun*

## TARLA NƏĞMƏSİ

Üfüqlər qızarıb, güləndə səhər,
Bülbül öpə-öpə oyatsın gülü.
Çirməyib qolunu qızlar, gəlinlər,
Yığsın qucağına sarı sünbülü.
Torpağa düşməsin havayı bir dən, –
Çörək bol olarsa, basılmaz Vətən!

Muğan səhraları bir tamaşadır,
Buğda zəmiləri qoşa-qoşadır.
Hər insan oğlunu çörək yaşadır,
Bol taxıl becərsə ana yurdumuz,
Tüfəngi bərk tutar Qızıl Ordumuz.

Tökülsün xırmana çöllərin varı,
"Boşaldım" deməsin elin anbarı.
Bu gün əsgər düşən mərd oğulları,
Gəlin, duz-çörəklə yola salaq biz,
Dildən-dilə düşsün tarla nəğməmiz.

Üfüqlər qızarıb, güləndə səhər,
Bülbül öpə-öpə oyatsın gülü.
Çirməyib qolunu qızlar, gəlinlər,
Yığsın qucağına sarı sünbülü.
Torpağa düşməsin havayı bir dən, –
Çörək bol olarsa, basılmaz Vətən!

*1941, 30 iyun*

## MIS-MIS

Boyun da var, buxunun da, pis də deyil vəzifən,
Ağız dolu bircə dəfə danışmadın yenə sən.
Mıs-mıs deyib dayanırsan hər kəlməni yeyərək,
Hər bir sözü hissə-hissə, uda-uda deyərək.
Sən özünü ağır təblə göstərirsən nəzərə,
Yüz sözündən bir söz belə anlamadıq bir kərə.
Nə yazıqsan, doğrudan da gülməlisən, zavallı,
Məncə, ölüm şərəflidir, yaşamaqdan bu hallı.

*1941, 5 iyul*

# QƏHRƏMANIN HÜNƏRİ

Adını şeirlə mən alqışladım,
Sərv ağacı kimi ucaldı başım.
Sənin dastanını belə başladım:
Sağ ol, Vətən oğlu! Sağ ol, qardaşım!

O qara qaşların çatıldı birdən,
Gözündə oynadı bir odlu şimşək;
Cəbhə dostlarına üz tutaraq sən,
Dedin ki: "Körpünü düşmən keçəcək...
Bir hədəf olsa da bu gün sinəmiz,
Gəlin, yol verməyək quldurlara biz!"

"Hazır ol!" – söyləyən o mərd səsindən
İgidlər yanında ayağa qalxdı.
Alovlar dağıdan xoş nəfəsindən
Hər əsgər qəlbinə bir qüvvət axdı.
Sonra sürünərək sən sinən üstə,
Körpüdə düşmənlə durdun üz-üzə.
O taydan qalxınca bir qara dəstə,
Yaylım atəşləri yayıldı düzə.
Quş kimi cəld olub üzüstə yatdın,
Birinci atəşin sovurdu yeri,
Bir anda bir daraq güllə boşaltdın,
Ağzıyla yer qapdı alman əfsəri.
Sən polad sinəni yerə verərək,
Ehtiyat içində süründün yenə.
Köksündə şir kimi döyündü ürək,
Azadlıq eşqinə Vətən eşqinə.
Çatdın bəllədiyin nöqtəyə, Kamal!
Qoyub dinamiti çəkildin dərhal...
Azacıq keçmədən alışdı şunur,
Körpü xırıltıyla qopdu yerindən,
Hər böyük zəfərdə dastan oxunur,
Yazdın bu dastanı öz əlinlə sən.

Çatdı yurdumuza şöhrətin sənin,
Çatdı səhər-səhər yellər əsəndə,
Adınla fəxr etdi böyük Vətənin.
İndi söz mənimdir, qulaq as sən də:
Güldü qəlbimizə sənin hünərin
Gözəl yaz gününün səhəri kimi.
Alqışa layiqdir o mərd əllərin,
Bizim Koroğlunun əlləri kimi.
Bildi şöhrətini ağ saçlı anan,
Köksünü dağ kimi verdi irəli...
Sənə alqış deyib, əl çaldı bu an
Qafqaz dağlarının şəlalələri.
Yayıldı şöhrətin Azərbaycana,
Şad olub sevindi düzlər, yamaclar.
Adını nəğməylə saldı dastana
Muğan çöllərində ötən turaclar...
Səninlə fəxr edir mənim dövranım,
Sinəndə döyünür eşqin ürəyi;
Sənə halal olsun, ey qəhrəmanım,
Babəklər yurdunun duzu, çörəyi!
Adını şeirlə mən alqışladım,
Sərv ağacı kimi ucaldı başım.
Sənin dastanını belə başladım:
Sağ ol, Vətən oğlu! Sağ ol, qardaşım!

*1941, 9 iyul*

## SƏNƏM QARININ PIÇILTILARI

Bizim kor Sənəmin bir mərəzi var,
Gündə yüz qapıya o baş vurmasa,
Sinədən söz doğub, söz uydurmasa, Ürəyi partlar.
Qalxıb başmağını geyər hər səhər,
Bir insan şəhərə ayaq basmamış;
Sənəm radioya qulaq asmamış
Deyir ki:
– Məndədir bu gün son xəbər!..
– Nə var? Xeyir olsun... Ay Sənəm qarı.
– Ay oğul, gördünüz ağ buludları?
– Nə olsun, göy də var, ağ bulud da var.
– Yox ey... bu qədər də heç bulud olar?
Bəlkə səməlketdir... Yox, Sənəm qarı!
Qatla cibinə qoy uydurmaları...
Əvvəlcə yerdə bax samalyotlara,
Sonra da oxşatma ağ buludlara...
Gördü ki, yığışır gəlib gedənlər,
Sənəm bu söhbətdən keçdi bir təhər...
Keçdi güllə kimi o, tindən-tinə,
Oturdu sahildə bir daş üstünə.
Bir az şair kimi baxdı dənizə,
Hər nəsə uydurmaq istədi bizə,
                              Bir şey çıxmadı...
Sonra Sənəm qarı, "o zülfü qara"
Baş çəkdi aynabənd mağazalara,
Qapıda saxladı o bir nəfəri:
– Ay qız... müharibə düşəndən bəri
Soğan da qalmayıb bu dükanlarda...
Ay bala, düşmən də qalmasın darda. –
Qız Sənəm qarının tutdu qolundan,
İçəri aparıb göstərdi bu an:
– Odur, bax, soğan da, çay, şəkər də var,
Nə qədər istəsən al evə apar.
Sənəm utanaraq astaca deyir:
– Doğrudan varmış ki... başıma xeyir...
Axşamdır... Həyətdə şəst oturmuşdur,

Qadınlar başına dövrə vurmuşdur.
Uzanmış Sənəmin tüklü çənəsi,
Ötür yavaş-yavaş o bayquş səsi:
– Bir yuxu görmüşəm, yuxu nə yuxu...
Özüm də bilmirəm nə olduğunu.
Gördüm ki, gəlinəm... geymişəm dümağ,
Çıraqban olmuşdur gəldiyim otaq...
Taxt üstə şah kimi çıxmışam yalqız,
Hamı qulluğumda dayanıb, ay qız –
Lakin bu sözləri dedikcə Sənəm,
Nədənsə əhvalı pozuldu bir dəm:
– Yuxuda toy görmək pisdir, deyirlər.
Barı gəlməyəydi qara bir xəbər...
Qoca vaxtımızda baxtımıza bax!
Deyəsən, qapımız qıfıllanacaq...
Nə bilim lemsədir, firəngdir nədir.
Sənəmçin yuxu da bir bəhanədir,
Onun doğrudan da öz mərəzi var,
Bir söz uydurmasa ürəyi çatlar,
Daş kimi yanına düşər qolları...
Lakin daha bəsdir, gəl, Sənəm qarı!
Şerin dustağısan bu gündən belə,
Gəl ki, sifətini göstərim elə...
Düşməndir arada söz gəzdirənlər,
Bəzən iblis kimi qəlbə girənlər.
Düşməndir boşboğaz dolaşan hər kəs,
Ağzı avaradan dost ola bilməz.
Bəsdir uydurduğun bu min bir yalan,
Düşməndir araya çaxnaşma salan.
Di gəl, daha bəsdir, gəl, Sənəm qarı!
Şair həbs eləyir boşboğazları.
Gəl düş qabağıma, tutmuşam səni,
Özüm quracağam son məhkəməni.
Budur əvvəlcədən verdiyim qərar.
– Vətəndaş deyildir söz uyduranlar!..
Gəl düş qabağıma, gəl, Sənəm qarı!
Şair həbs eləyir boşboğazları!

*1941, 15 iyul*

## UŞAQ BAĞÇASI

Yenə də al geyib qızarır göylər,
Əsir sərin-sərin dəniz küləyi,
Açır gözlərini yuxudan səhər,
Xoşdur təbiətin fikri, diləyi,
Əsir sərin-sərin dəniz küləyi...

Suyun sahilində bir bağçacıq var,
Çiçəkli, yarpaqlı, sarmaşıqlıdır.
Quş kimi dil açmış burda uşaqlar,
Bu bağça nə qədər yaraşıqlıdır,
Çiçəkli, yarpaqlı, sarmaşıqlıdır.

Sahili döydükcə bəzən ləpələr,
Şairin xəyalı uçub yüksələr.
Dənizin seyrinə çıxır körpələr,
Elə bil ulduzlar salama gəlir...
Şairin xəyalı uçub yüksəlir...

Burda dəstə-dəstə gəzən balalar
Əl-ələ tutuşub yallı gedirlər.
Çalır orkestro... Onun qəlbi var,
Verir körpələrə dünyadan xəbər,
Əl-ələ tutuşub yallı gedirlər.

Günəşli gündüzlər nəslidir bunlar,
Gözləri açıqdır, üzləri şaddır.
Bu gün hünər dərsi verir oyunlar,
Bizim körpələrin qəlbi azaddır;
Gözləri açıqdır, üzləri şaddır.

Siz ey cəbhələrdə vuruşan ərlər!
Günəşdən yarandı bizim nəslimiz.
Arxasız deyildir sizin körpələr,
Sinəmiz üstündə saxlayırıq biz;
Günəşdən yarandı bizim nəslimiz.

Burda bu bağçada hər oğlan, hər qız
Böyüyüb bir igid, bir ər olacaq.
Onların nəsibi həyatdır yalnız,
Onların ilk dərsi hünər olacaq,
Hər biri bir igid, bir ər olacaq.

Gəlin, balalarım, öpüm sizi mən,
Bir duman görməsin xoş sifətiniz.
Oxuyun, zövq alın mənim şerimdən,
Var olsun qəlbiniz, məhəbbətiniz,
Bir duman görməsin xoş sifətiniz!..

*1941, 16 iyul*

# İGİD ŞAHİN

*Şerim qanadlanıb tez tapsın onu –*
*Qardaşım Məzahir Həmid oğlunu.*

Qanad çalıb uçdu yenə körpə tərlan yuvadan,
Uçub getdi şimşək kimi göy dalğalı havadan.
O qıy vurub şığıdıqca səsindəki gücə bax,
Caynağında didim-didim parçalandı yapalaq.
Qırıb tökdü sərçə kimi göy üzündə düşmanı,
Tərlanıma salam verdi ulduzların karvanı...
Alovların qucağında o yol açdı mərdana,
Mərd oğula halal eylər öz südünü mərd ana.
Tərlanımın qumral gözü qamaşmadı küləkdən,
O hayqırıb maral kimi çıxdı min bir sürəkdən;
Sıx buludlar, boz dumanlar qaldı ayaq altında,
O düşmənə meydan açdı göyün yeddi qatında;
O tufanlar arasında çatdı qara qaşını,
Tezcə aldı qanadına yaralı yoldaşını.
Dayanmadı qəhrəmanım, yenə süzdü irəli,
Buludları parçaladı onun şahin gözləri.
Aha... Qaçır qabağından, qaçır düşmən dəstəsi,
Lakin ona "gəldim!" deyir tərlanımın nərəsi.
Bir də, bir də qıy vuraraq çatdı bizim qəhrəman,
İlişdirdi gülləsini quzğunların başından.
Yandı düşmən təyyarəsi, alışdı bu davada,
Alovlanıb duman kimi yanıb-söndü havada.
Endi körpə tərlanım da yavaş-yavaş dənizə.
Bir sərinlik gəldi o vaxt bizim də qəlbimizə.
Qanadını gərdi suya, meydan açdı dalğalar,
Tərlanımın göylərdə də, sularda da yurdu var.
Düşdü axşam... Gəldi gecə... Görünmədi sahillər,
Dəniz qara, gecə qara, işıqdan da yox əsər.
Soyuq kəsir qılınc kimi... Qəhrəmanım dardadır,
O danışır öz qəlbində: "Bizimkilər hardadır?"
Dəniz coşur, köpüklənir... O qışqırır, bağırır,
Sanki mənim tərlanıma kömək əli çağırır.

Daldı mənim tərlanımın uzaq görən gözləri,
Gəldi onun xatirinə atasının sözləri:
“Oğul, harda dara düşsən, arxalan hünərinə,
Sən ölümü bir an belə gətirmə gözlərinə...”
Qəhrəmanım gülümsədi, qüvvət gəldi qəlbinə,
Dalğalara sinə gərdi, meydan açdı o yenə.

Doğdu gül üzlü səhər
İşıqlandı üfüqlər...
Susdu dəniz bir anda.
Lap uzaqda o yanda
Zirvəsi al bayraqlı,
Tamam yarlı-yaraqlı
Bir gəmi görsəndi, bax,
Dalğaları yararaq,
Yaxınlaşdı bu yana,
Bizim körpə tərlana.
“Aha, bizimdir” – deyə,
Nərə çəkdi o göyə.
Gəlib dayandı gəmi,
Nə xoşdur vüsal dəmi.
Artıq görüşdü əllər...
Saf arzular əməllər.
Oturdular gəmiyə.
Günəş: “Yaxşı yol!” – deyə
Yola saldı onları,
Bizim qəhrəmanları.

Yetişdi sahilə körpə tərlanım,
Tarixdə ad qoydu o qəhrəmanım:
“Tapşırıq görüldü, yoldaş komissar!
Mən yenə hazıram, nə əmriniz var?”
Komissar yaxına gələrək bu an,
Öpdü Məzahirin açıq alnından.
Dedi: “Doğrudan da sən bir igidsən,
Adınla fəxr etsin anamız Vətən”.
Gəldi ana yurda bu gözəl xəbər,

Saz aldı söz qoşub, tərif deyənlər.
Bəzəndi şöhrətlə hər çöl, hər çəmən,
Nə qədər xoşbəxtəm bu dünyada mən.
Tarixdə ad qoyur qəhrəmanlarım,
Gündə min gül açır mənim baharım...
Uçun, tərlanlarım! Öpürəm sizi,
Qəlbimdə döyünən saf qəlbinizi...
Sizindir ilhamım, şerim əzəldən,
Sizinçün yaşayıb, yaradıram mən.

*1941, 19 iyul*

## MƏHƏBBƏT

İztirab içində yatır qəhrəman,
Nə qədər solğundur onun bənizi.
Canında qalmamış artıq isti qan,
Doktor kömək üçün çağırır bizi:
"Gəlin, bu igidə qan verək bir az,
Yoxsa bu yaradan xəstə sağalmaz"

Odur, laçın gözlü bir qız gələrək
Açdı sağ əlilə öz sol qolunu.
"Tez ol, qan al! – dedi o gözəl mələk, –
Öz qanım sağaltsın vətən oğlunu".
Doktor sevinərək durmadı bir an,
Qan aldı o qızın şümşad qolundan.

Azacıq keçmədən tərpəndi xəstə,
Yenə də dünyaya baxdı gözləri.
Qız çiçək də verdi ona bir dəstə,
İnsanlıq böyükdür əzəldən bəri...
Xəstənin köksündə çırpındı ürək,
Baxdı gözəl qıza gülümsəyərək.

Dolandı həftələr... Qalxdı qəhrəman
Yenə xatirinə düşdü cəbhələr...
O ayrı düşmüşdür yoldaşlarından,
Qəfəsdə bağlanıb qalarmı hünər?
Alıb silahını düzəldi yola,
Dalınca qız dedi: – uğurlar ola!

O getdi şir kimi, toz qalxdı yerdən,
Baxdı arxasınca qızın gözləri;
De neçin qaşların çatıldı birdən?
Nə keçdi qəlbindən, ey gözəl pəri?
Gedən sevgilindir sənin, bəlkə də...
Onu çox görməsin sənə təbiət.
Qanlar qardaşlığı olan ölkədə
Dünya od tutsa da, ölməz məhəbbət!

*1941, 20 iyul*

## SOVQAT

Sevgilim, qış gəlir, şaxta düşəcək,
Yenə axar çaylar buz tutacaqdır.
Yenə çapırdacaq atını külək,
İsti ocaqları soyudacaqdır.

Ağzını qurd kimi ayıracaq qış,
Bir də qıcayacaq ağ dişlərini.
Dümağ geyindikcə o başı batmış,
Yenə qar basacaq dağ döşlərini.

Sənsə cəbhədəsən belə bir gündə,
Tüfəngin dabanda bir döyüşçüsən.
Vətən məhəbbəti olan köksündə
Mənim də eşqimi yaşadarsan sən.

Bir corab, bir əlcək, bir isti köynək,
Bir də ki, yun başlıq göndərirəm, al!
Səni qılınc kimi kəsməsin külək,
Sən də nərə çəkib, qılıncını çal!

Gey bütün bunları şaxtada, qarda,
Gey ki, əl-ayağın üşüməsin heç.
Əynin isti qalsın, fırtınalarda,
Cəbhədən şir kimi sən atlanıb keç.

*1941, 8 sentyabr*

## HƏYAT EŞQİ

Siz ey dost olduğum, qardaş olduğum,
Siz ey hər sirrinə sirdaş olduğum,
Gül üzlü səhərlər, şehli çiçəklər,
Ey həyat aşiqi canlı ürəklər!
Bizim hər eşqimiz hökmü əzəldir,
Yaşamaq şirindir, həyat gözəldir.

Sən ey ana vətən, ey ana torpaq,
Sən ey sarı sünbül, ey yaşıl yarpaq,
Eşqimiz yaşayır qəlb otağında,
Hər gül ağacının bir budağında,
Bülbüllər özünə yuva düzəldir,
Yaşamaq şirindir, həyat gözəldir.

Siz ey şərəfinə şeir qoşduğum,
Şahin vüqarına baxıb coşduğum,
Koroğlu yurdunun mərd insanları,
Siz ey sənətimin qəhrəmanları.
Şeirlər demişəm mən sizə bir-bir,
Yaşamaq şirindir, həyat gözəldir.

Gəlir ölüm səsi, fəlakət divi,
Yanır od içində həyatın evi.
Qoy insan aşiqi hər duyan ürək,
Atılsın meydana şir tək, pələng tək.
Hər odu, yanğını söndürən əldir,
Yaşamaq şirindir, həyat gözəldir.

Gəl qardaş! Çağırır bizi bu torpaq,
Ölümün gözünə nizələr sancaq.
Qərq olub getsək də qanlar göləndə,
Həyatı qoymayaq ölüm əlində.
Yaşamaq ən gözəl, ən xoş əməldir,
Yaşamaq şirindir, həyat gözəldir.

*1941, 18 oktyabr*

## MOSKVA

Sən ey xəyalilə deyib güldüyüm,
Qədrini canımdan əziz bildiyim,
Tarixlər şahidi qocaman şəhər!
Nədir qəlbindəki o döyüntülər?
Başından əssə də min acı külək,
Dayanmaz sinəndə çırpınan ürək.
Dayanmaz yayından atılan oxlar...
Tarixin ağ saçlı bir qanunu var:
Zülmət oynasa da bir an göylərdə,
Tutulmaz günəşin üzünə pərdə.
Kəmənd də atılmaz axar sulara,
Həqiqət çəkilməz boğazdan dara.
İnsanlıq eşqilə düşünən bir baş
Yaranmış yerlərə, göylərə sirdaş...
Sən, qızıl Moskva! Sən, gözəl şəhər!
Sənin şöhrətinlə ucalır bəşər
Bir ana qoynudur isti qucağın,
Qəlbə mehribandır odun, ocağın.
Səninlə duz-çörək kəsdiyim gündən
Sən mənim anamsan, öz balanam mən.
Moskva! – Nə qədər doğmadır bu səs,
Doğmalar dar gündə yad ola bilməz!..

Moskva basılmaz sənin qüdrətin,
Canlı heykəlisən əbədiyyətin!
Mənim rus qardaşım, səndəki vüqar
Nəsildən-nəsilə qalmış yadigar.
Leninin yurdudur sevdiyin vətən,
Puşkinin şerilə ucalmısan sən.
Ürəyin genişdir, kamalın dərin,
Bilirsən dilini çətinliklərin.
Azadlıq çırağı əlində yanır,
Hünərin qəlbində, dilində yanır.
Onu tufanlar da söndürə bilməz,
Moskva! – Nə qədər böyükdür bu səs...





Sən qızıl Moskva! Sən, gözəl şəhər!
Sənin şöhrətinlə ucalır bəşər.
Sənsən ölkəmizin fikri, diləyi,
Ayırmaq olarmı candan ürəyi?!
Qoy daşın, torpağın qalxsın ayağa!
Hər insan ürəyi dönsün bir dağa!
Hər oğlun, hər qızın bir əsgər olsun,
Hər igid sinəsi bir səngər olsun!
Sənin dövlətinə göz dikən alçaq
Yalnız öz ömrünə qəbir qazacaq!..

*1941, 23 oktyabr*

## OKTYABR

Sən ellər toyusan, ellər bayramı,
Könüllər mülkünün laləzarısan.
Mən səndən almışam eşqi, ilhamı,
Sən şair ömrünün ilk baharısan.

Əyninə geydiyin o qızıl köynək
İgidlər qanından bir yadigardır...
Gəl, əziz bayramım, bir də öpüşək,
Eşqinlə yaşayan nə bəxtiyardır!..

O gün ki, aləmə yayıldı şölən,
Dağlar öz donunu lalədən biçdi;
Hər qəlbə gün kimi yayıldıqca sən,
Şöhrətin iqlimdən iqlimə keçdi.

Baxdı insan oğlu xoş amalına,
Çəkdi bayrağını gül üzlü səhər.
Alqış dövranına, istiqbalına,
Kor olsun üzünə kəc baxan gözlər!

Yüz il qələm çalsam gözəl hüsnünə,
Doyarmı eşqindən sadiq bir ürək?
Alqış bu dövrana, alqış bu günə,
Gəl, əziz bayramım, bir də öpüşək!

Gəl ki, sən gələndə şadlanır ömür,
Gül açır gəncliyin dili, ağızı;
Səhralar al geyib gülə bürünür,
Sevinir yurdumun oğulu, qızı.

Əlində tutduğun o böyük məşəl
Göstərir aləmə qurtuluş yolu...
Bütün yer üzünün salamına gəl,
Qoy öpsün alnını hər insan oğlu!





Əyninə geydiyin o qızıl köynək
İgidlər qanından bir yadigardır.
Gəl, əziz bayramım, bir də öpüşək,
Eşqinlə yaşayan nə bəxtiyardır!..

*1941, 6 noyabr*

## UKRAYNA PARTİZANLARI

De, kimdir gecənin bağrını dələn?
Düşmənin üstünə ley kimi gələn?
Kimin qüdrətinə güvənir Vətən?
Kimdə sədaqət də, mərdlik də vardır? –
O bizim qəhrəman partizanlardır!

De, kimin səsindən titrəyir dağlar?
Barmaqla göstərir onu uşaqlar?
Kimin yuvasıdır meşələr, bağlar?
Kimin hər zəfəri bir yadigardır? –
O bizim qəhrəman partizanlardır!

Kimdir qartal kimi qayada yatan,
Pəncəsi düşmənin gözünə batan?
De, kimdir döyüşdə yüzə yüz atan?
De, kimin qalası sıx ormanlardır? –
O bizim qəhrəman partizanlardır!

De, kimin yurdudur sünbüllü çöllər?
Kimindir banduru söylədən əllər?
Kimindir yanağı lalə gözəllər?
De, kimin sevdası bir ilk bahardır? –
O bizim qəhrəman partizanlardır!

De, kimdir düşmənə min tələ quran?
Tarasın qəbrində keşikçi duran?
De, kimdir Karmelyuk əlilə vuran? –
Bizim ukraynalı qəhrəmanlardır,
O bizim qəhrəman partizanlardır!

De, kimdir adına qardaş dediyim?
Qəmimə, nəşəmə sirdaş dediyim?
De, kimdir vətəndaş, yoldaş dediyim? –
Bizim Koroğlu tək pəhləvanlardır,
Bizim ukraynalı partizanlardır!

*1942, 30 yanvar*

## AZƏRBAYCAN BALASI

Şair Nizaminin gözəl vətəni,
Qoynunda bəsləyib böyütdü səni,
Oxşadı alnını ulduzlu göylər,
Açdı qucağını gül üzlü səhər.
Bir yanda Xaçbulaq, bir yanda Qoşqar,
Bizim dünya görmüş o qoca dağlar,
Kəpəzin, Göy gölün təmiz havası,
Qayalar döşündə qartal yuvası,
O dağlar mülkünün min çoban səsi,
Kəhriz başındakı çinar kölgəsi
Sənin qismətinə düşdü əzəldən;
Sinədən söz qoşub şeir düzəldən
Ellər məclisində oturub-durdun,
Könül tərlanını burdan uçurdun.

Aşıqlar saz tutub söz açan zaman
Dastanlar eşitdin qoç Koroğludan;
Sıçrayıb Qır atın belinə qalxdın,
Sel kimi kükrəyib, su kimi axdın,
Misri qılıncını çaldın dörd yana,
Düşmənə gəl dedin mərd-mərdana.
İllər dolandıqca sən doldun yaşa,
Gözəllər boyuna etdin tamaşa...
Bir yerdə dincəlib durmadan bir an
Keçdin dərələrdən, aşdın dağlardan,
Gah qılınc oynatdın, gah nişan atdın,
Turaclı çöllərdə sən at oynatdın.
Sən də igidlərlə çıxıb sürəyə*

Toyların nəməri mənimdir deyə,
Öz kəhər ürgəni çapdın dördnala
Qoymadın nəməri başqası ala.
O zaman köksünə sığmadı vüqar,

---
* At çapmağa

Bizim dünya görmüş arif qocalar
Barmaqla göstərdi səni o zaman,
Qəhrəman dedilər sənə, qəhrəman!

Kənddə deyirlər ki, bir buğa varmış,
O şiş buynuzilə adam vurarmış.
Əlindən insanlar gələrmiş təngə,
Kimsə girişməzmiş onunla cəngə.
Naxır qayıdanda bir axşam çöldən
Üz-üzə gəlmisən o buğayla sən:
"Buğa, bu adətdən bir dəfə əl çək!
Yenəmi əcəlsiz insan öləcək?".
Buğa tüklərini qabardıb birdən,
Səni buynuzlamaq, vurmaq istərkən
Beyninə sıçramış qəzəbindən qan.
Buğa nərə çəkib şığıyan zaman,
Dartaraq heyvanın buynuzunu sən
Çəkib çıxarmısan onu dibindən.
Oxucum sormasın bu sözlər nədir,
Nə deyim... bəlkə də bir əfsanədir
Qoy olsun, ellərdir yaradan bunu,
Ellər sevəcəkdir öz mərd oğlunu.

O gün ki, dilləndi topların səsi,
O gün ki, ölümün ilan nəfəsi
Yayıldı qəflətən ana torpağa,
Sən Vətən eşqilə qalxdın ayağa...
Sən Qızıl Orduya getdiyin zaman
Alnından öpərək demişdi anan:
"Get oğlum! Yoluna uğurlar olsun!
Vətən məhəbbəti sənə yar olsun!
Döyüşdə düşmənə arxa çevirsən,
Südüm haram olsun sənə bu gündən!.."

Sən əsgər olduğun o vaxtdan bəri
Qaldı qulağında ana sözləri.
Nə yağmur, nə yağış, nə boran, nə qar,

Nə də fil xortumlu dəhşətli toplar,
Nə düşmən hiyləsi, nə duman, nə çən,
Nə də ki, başının üstündən keçən
Qara qarğaların ölüm xəbəri
Səni qorxutmadı o gündən bəri.
Üşütmə düşmədi canıma bir an,
Güllələr çoyuyub keçdi yaxından...

Şöhrətin olmuşdur dillərdə dastan,
Hünərlə yaradır şöhrəti insan.
Adınla fəxr edir bizim yamaclar,
Muğan çöllərində ötən turaclar.
Adınla fəxr edir bizim analar,
Göy gölün üstündə süzən sonalar.
Adınla fəxr edir şeirlə sənət.
Ölməz qəhrəmanlıq, ölməz məhəbbət!
Səndən aşıqlar da deyib coşurlar,
Adına indidən dastan qoşurlar.

Oxu bu şerimi, al salamımı,
Gözümdə qoymadın mənim kamımı...
İnan ki, aləmdə nə qədər sağam,
Sənin dastanını mən yazacağam.

*1942, yanvar*

## SALAM, MOSKVA!

Başında tufanlar qopandan bəri
Səkkiz ay görmədim heç üzünü mən
Lakin əməl kimi, ellər şəhəri,
Bir an da getmədin nəzərlərimdən...

Sən açıq alnınla, gülər üzünlə,
Hər vaxt dayanırdın mənim qarşımda.
Çünki hər gecənlə, hər gündüzünlə
Həmsöhbət olmuşam gənclik yaşımda.

Quldurlar gecəni dəldiyi zaman,
Yollar bağlanarsa, uzaqlaşar səs...
Fəqət, bir qayda var ata-babadan,
Mənzil uzansa da, dostluq kəsilməz.

Biz yenə görüşdük! Qalmadı o qəm...
Keçdi o duyğumun hicran günləri;
Başına pərvanə olmuşdur bu dəm
Bir şair qəlbinin xəyal şəhpəri.

Yenə mən keçirəm küçələrindən,
Yenə qaynayırsan, qocaman şəhər!
Yenə hökm edirsən şüurlara sən,
Yenə də işlədir yaradan əllər!

Rast gəlir yenə də dostlar, tanışlar,
Görüşür əl verib öpüşürük biz.
Qaşlar çatılmışdır, sərtdir baxışlar
İndi müsəlləhdir bütün nəslimiz!..

Göylərə baş vuran qədim binalar
Dayanmış əvvəlki əzəmətiylə.
İldırım çaxsa da əyilməz vüqar;
Əyilməz insanlıq məhəbbətiylə!

Yenə Qızıl Meydan hər axşam, səhər
Açır sinəsini pəhləvan kimi.
Yenə də üstündən keçir nəsillər
Günəşə yol açan bir karvan kimi...

Yatmış günəş kimi sirri dərində
Mavzoley – Leninin böyük məzarı.
Parlayır onun da şəfəqlərində
Bəşər taleyinin bir ilk baharı.

Bayırda şaxtadır, buz bağlamış qar,
Deyirlər rus qışı bərk gəlmiş bu il.
O, dünya görmüşdür... bilir, yağılar
Boransız, süngüsüz məhv olan deyil!

Budur, bir meydanda rast gəlir mənə
Tatyana Larina, dəyişmiş bütün.
Qızartı çökmüşdür yanaqlarına,
Solğun görünməyir bənizi bu gün.

Qapamış Tatyana öz romanını,
Örtmüş pəncərəni o nazlı mələk;
Seyr edir zamanın qəhrəmanını,
Əynində şinel var, çiynində tüfəng.

Küləklər döydükcə al yanağını,
Nədir gözlədiyin? – soruşuram mən.
Deyir: gözləyirəm eşqin bağını
Bu qopan çovğundan, əsən küləkdən!..

O yanda Puşkinin heykəlinə bax!
Dalğalı saçları ağarmış qarla;
Bir qaya başına qartal qonaraq,
Dayanmış yenə də sakit, vüqarla!

Görürəm dalğındır bu dahi şair,
Elə bil canlıdır onun nəfəsi.

O indi düşünür həyata dair,
Dinir qulağında topların səsi!

Yenə də hörmətlə dinləyir Vətən
İlhamın, sənətin xoş nəğməsini
O yenə dastanlar yaradır bilsən,
Ucaldır şairin Vətən səsini.

Sən ona diqqətlə bir də qulaq as!
Deyir bir qanunu xatirinə sal:
Odlar içində də yanıb qaralmaz,
Məhəbbət, sədaqət, həqiqət, kamal!..

*1942, 5 fevral*

## HƏYAT FƏLSƏFƏSİ

Quşlar qatar-qatar ellərdən keçər,
Bəşər nəsil-nəsil dünyadan köçər;
İnsanlıq gah zəhər, gah şərbət içər...
Əzəldən belədir hökmü zamanın –
Düyümlü bir sirri var asimanın!

Çarxını qurduqca dövranın əli
Bəzən ağlar olur, bəzən gülməli...
İnsanın ən böyük eşqi, əməli
Bəzən aslan kimi çırpınır darda,
Bəzən də qərq olur fırtınalarda...

Dəyişir səmtini daima sular,
Dəyişir fikirlər, dönür duyğular.
Kainat tutmayır bir yerdə qərar:
Çarpır sinəsini qayalıqlara –
O gah qışa çıxır, gah da bahara!

Dünya binasını qurandan bəri
Səadət adlanan o gözəl pəri
Gəl! – deyə səsləmiş qərinələri;
Yazıqlar olsun ki, hələ insanlıq
Gəlib qovuşmamış ona bir anlıq.

Ey dünya gözəli, qaçma bəşərdən!
İnsandır ayıran xeyiri şərdən...
Gəl onun eşqini ucuz tutma sən, –
Qəlbi var, hissi var hər məhəbbətin,
Qaralmaz ulduzu əbədiyyətin!..

Ölüm bir iblisdir, həyat bir mələk!
Varlığı izləyir heçlik kölgə tək...
İşıq qaranlıqla pəncələşərək
Yaşatmaq istəyir cahanda bizi,
Günəş salamlayır iradəmizi!

Yamanlıq, yaxşılıq durmuş üz-üzə,
Dilsiz əsrlərdən mirasdır bizə.

Əsir bahar yeli qəlblərimizə,
Lakin arxasınca kəfən geyir qış,
Təbiət varlığa belə qarğamış.

Bir bayram sözü var, bir də ki, matəm,
Nəşə bir aləmdir, qüssə bir aləm.
Həyat öz atını sürür dəmadəm;
Odlar içində də hər bir mənzərə
Yenə qanad verir düşüncələrə!

Yenə də insanın xəyal şəhpəri
Gəzir fəzaları, göy dənizləri.
Sən ey səadətin gözəl səhəri!
Alqışla insanın pak əməlini,
Uzat yer üzünə hünər əlini!

Zamandır, bəşərin imdadına gəl!
Xəstə bir gözəldir hünərsiz əməl...
Hünər söylədiyim o qüdrətli əl
Bütün kainata qoy qanad gərsin,
Bəşər karvanına o yol göstərsin.

Hünər qanad versin torpağa, daşa,
Dənizlər çatılıb gəlsin baş-başa...
Azadlıq ordusu varsın birbaşa,
Hər zəfər dastanı yadigar olsun,
Ölüm təslim olsun, həyat var olsun!

Dünyaya bir şöhrət yaranmışıq biz,
Günəş çökməmişdir qaranlığa diz.
Qoy ölsün yamanlıq, o xain iblis!..
Yaxşılıq çağırsın hər qəlbin neyi,
Qurtaraq zəncirdən Prometeyi...

Fəlakət qocalmış... qartdır o köpək.
Onun sümükləri tez çürüyəcək...
Səadət – gənclikdir, adı – gələcək!
Onun gözlərində həyat eşqi var –
Var olsun gələcək! Var olsun bahar!

*1942, 22 mart*

## PARTİZAN BABAŞ

Sorağını alsam belə bu gün sənin uzaqlardan,
Məhəbbətə hasar çəkməz nə ayrılıq, nə də zaman...
Deyirlər ki, partizansan, çöllər olmuş sənə məskən,
Deyirlər ki, qar əriyir, buz əriyir nəfəsindən.
Sən Belarus torpağına uzatdıqca qardaş əli
Səhər ilə salamlaşır qardaşlığın pak əməli.
Deyirlər ki, o yanlarda ağır gələn qışlar olur,
Deyirlər ki, döşəyin yer, yastığınsa daşlar olur!
Sən süngünlə, dırnağınla yer altına yol açırsan,
Sən qaranlıq gecələrə gözlərindən nur saçırsan.
Bəzən olur ağacların, yarpaqların söhbətindən
Dinləyirsən asta gələn quldurların səsini sən.
Bəzən olur bütün gecə yatmayırsan sən bir anlıq;
Əziyyətsiz qazanılmaz bu dünyada qəhrəmanlıq.
Bəzən olur ovçu kimi qar üstündə iz salırsan,
Kəsib karvan yollarını nişanını düz alırsan.
Sən düşməni sovurduqca göy üzünə küllər kimi.
Üzərinə qar tökülür ağ çiçəklər, güllər kimi.
Şaxta vurub buz donsa da sənin yaqut yanağında
El qeyrəti, vətən eşqi güllər açır dodağında...
Sən ayazlı gecələrdə ulduzların sirdaşısan,
Boranların, çovğunların, dumanların qardaşısan.
Sarsıtmamış varlığını yağan yağış, əsən külək,
Açılmışdır qəlb evində əməllərin çiçək-çiçək.
Sən deyirsən: “Qəlbimizdə Koroğlunun qanı vardır”.
Mən deyirəm: “Bu namusla yaşayanlar bəxtiyardır”.
Sən deyirsən: “Misri qılınc! Leş bir yana, baş bir yana”.
Mən deyirəm: “Ölüm yoxdur od içində qəhrəmana”.
Sən deyirsən: “Xoş yaşasın ana yurdun qız-gəlini”.
Mən deyirəm: “Səhər yeli öpsün sənin mərd əlini”.
Sən deyirsən: “Ayağa qalx!” – Azərbaycan torpağına.
Mən deyirəm: “Ana yurdun qəlbi dönür Qaf dağına”.
Sən deyirsən: “Radiomu meşələrdə quranda mən,
Eşidirəm, zövq alıram ana yurdun nəğməsindən”.

Mən deyirəm: “Qoy var olsun sinəndəki el ürəyi,
Mərd oğullar ayaqlamaz and içdiyi duz-çörəyi”.
Danışdıqca hünərindən bizim hava dalğaları,
Sənin anan, dünya görmüş, ağbirçəkli Tamam qarı
Öz gəlinlik paltarını sandığından çıxardaraq,
Varaqlayır dastan kimi öz ömrünü varaq-varaq...
O şad olur, o sevinir balasının hünərindən,
Günəş qalxıb nur dağıdır ona vətən göylərindən.
Bir zamanlar tüfənginlə cəbhələrdən gələndə sən,
Ana qəlbi öpəcəkdir o üzündən, bu üzündən.
Namusunu gözlədiyin gözəllər də dəstə-dəstə,
Gül-çiçəklə çıxacaqdır sən gəldiyin yollar üstə.
Can qardaşım! Sən mənimsən, sən mənim partizanımsan,
Yeni günlər yaradanım, yeni tarix yazanımsan.
Qoy ulduzlar dəstə-dəstə öpsün sənin mərd əlini,
Günəş yazsın üfüqlərə hər eşqini, əməlini!

*1942, 21 dekabr*

## GÖZ AYDINLIĞI

Ay ellər, obalar, gözünüz aydın!
Düşmənin səfləri pozulur bu gün;
Bizim qoç igidlər nərə çəkdikcə,
Zalımın məzarı qazılır bu gün.

Zaman öz hökmünü verəndən bəri,
Açır cəmalını dağlar səhəri.
Dumandan sıyrılır Vətən göyləri
Durnalar qatara düzülür bu gün.

Parlayır günəşi ana Vətənin;
Ulduzu qaralır pis Əhrimənin.
"Göyün allahıyam" deyən düşmənin
Ayağı yerlərdən üzülür bu gün.

Ordumuz yürüyüb ellər keçəndə,
Yadları ot kimi qırıb biçəndə,
Analar sevinib, şərbət içəndə,
Tarixə dastanlar yazılır bu gün.

*1943, 8 fevral*

## DAĞLAR

Binələri çadır-çadır
Çox gəzmişəm özüm, dağlar!
Qüdrətini sizdən aldı
Mənim sazım, sözüm, dağlar!

Maral gəzər asta-asta,
Enib gələr çeşmə üstə.
Gözüm yolda, könlüm səsdə,
Deyin, necə dözüm, dağlar?

Hər obanın bir yaylağı,
Hər tərlanın öz oylağı;
Dolaylarda bahar çağı
Bir doyunca gəzim, dağlar!

Qayaları baş-başadır,
Güneyləri tamaşadır.
Gödək ömrü çox yaşadır
Canım dağlar, gözüm dağlar!

Bir qonağam bu dünyada,
Bir gün ömrüm gedər bada;
Vurğunu da salar yada
Düz ilqarlı bizim dağlar.

*1943, 15 fevral*





## GÜLƏ-GÜLƏ

Maral çıxdı dağ döşünə
Səhər vaxtı gülə-gülə,
Sol əlilə sağ döşünə
Bir gül taxdı gülə-gülə.

Bilərziyi ağ altundan,
Yerə düşdü göy atından...
Ala gözlər qaş altından
Süzüb axdı gülə-gülə...

Dedim: "Ay qız, nədir adın? "
Dedi: "Mənəm, gözün aydın!"
Dedim: "Bizə dost olaydın!"
Dönüb baxdı gülə-gülə.

Dedim: "Aydır, gündür üzün?!"
Dedi: "Məni dindir özün!"
Gəldi cavan ömrümüzün
Tərlan baxtı gülə-gülə.

Ay dolandı, il dolandı,
Unuduldu eşqin andı.
O verdiyi sözü dandı,
Daşa çaxdı gülə-gülə.

*1943, 16 fevral*

## QOCA QARTAL

Dağ döşündən qoca qartal,
Göy üzünə nəzər saldı.
Onun qanı coşdu dərhal,
Bir qıy vurub qanad çaldı.

Uçdu qartal iftixarla,
Bir ox kimi süzüb getdi.
Göydən yerə o vüqarla,
Baxıb-baxıb gözdən itdi.

Hava döndü, qopdu külək,
Göyün üzü lap qaraldı.
Qartal göylə əlləşərək
Qanadından lələk saldı.

Əl çəkmədi dəli rüzgar,
Qamçıladı o qartalı.
Çaxnaşdıqca ağ buludlar,
Guruldadı göy qavalı.

Çox əlləşdi o bir zaman,
Buludları aşsın deyə.
Sinəsindən açıldı qan,
Son dəfəcik mavi göyə.

O həsrətlə baxıb yenə,
Bir daş kimi yerə düşdü.
Qurban oldu öz eşqinə,
Nəcib ruhu göyə uçdu.

*1943, 17 fevral*

## SALAM, DOSTUM!

Nə qədər şirindir ömrün günləri,
İnsan yaşadıqca yaşamaq istər.
Vətən torpağında doğan hər səhər –
O dağ lalələri, səhra gülləri
Yaşamaq şirindir deyir hər zaman;
Yaşamaq eşqilə yaradır insan!

Ancaq zaman-zaman vaxtsız ölümlər
Döyür qapıları qurban istəyir.
Bəzən açılmadan solur min hünər,
Ölüm qəh-qəh çəkir, "güclüyəm" – deyir!

Ölüm söylədiyim o xain iblis
Bir düşmən yaranmış gözəl varlığa;
Ölümü öldürsün qoy əllərimiz,
O, qılınc çəkməsin bəxtiyarlığa!

Sən həyat dostusan, ellər zinəti!
İnsanlıq eşqidir sinəndə yanan.
O saf qəlbindəki pak məhəbbəti
Bir vaxt laylasında çalmışdır anan!

Açıq alnındakı o sadə vüqar
Bizim babalardan bir yadigardır.
Doğru söz, düz ilqar, bir də etibar –
Qəlbində müqəddəs bir dünya vardır.
Yuxusuz gecələr çox keçirmisən,
Üzündən şövq almış xəstəxanalar.

Ölümdən insanı qaytardıqca sən,
Gözünün yaşını silən analar
Xeyir-dua demiş sənə hər zaman,
Yaxşılıq çıxmayır dünyada yaddan!

Eşqin şərbətini hələ içmədən
Ölüm yatağına düşən bir pəri
Şikayət etdikcə öz taleyindən,

Səndəki o həssas Loğman əlləri
Ona can vermişdir, ey mahir ustad!
Yaşasın məhəbbət, yaşasın həyat!..

Sənin hünərinlə neçə qəhrəman
Əsgər paltarını geymiş yenidən.
Qılınc qurşamışdır neçə pəhləvan,
Baxıb öz oğluna sevinmiş Vətən.
Sevinmiş anamız – Odlar ölkəsi,
Səni alqışlamış min qəlbin səsi!..

Dostum! Şöhrətinlə fəxr edirik biz,
Bizə çox görməsin səni təbiət!
Yaşasın, yaratsın nəsillərimiz...
Elmin şərəfinə yazılan qüdrət
Vətən torpağında bir çıraq olsun,
Yaradan insanın üzü ağ olsun!

Sən də bilirsən ki, əzəldən bəri
Dahilər yurdudur ana Vətənim.
Safdır, müqəddəsdir pak əməllərin;
Bu böyük səadət haqqımdır mənim!
Bizə döşlərindən süd verən ana
Bizi tapşırmışdır Azərbaycana!

Yarış meydanıdır əzəldən aləm,
Görüm büdrəməsin sürdüyümüz at...
Bir ölməz şöhrətdir cahanda qələm,
Qələmlə qurulur ən böyük büsat!
Diləyim budur ki, hər gecə, hər gün,
Sənin qələmindən inci tökülsün!

Bir şair sözünü yadında saxla,
Bil ki, bu dünyada hünər qalacaq...
Elmin qüdrətilə yüz kitab bağla!
Ellər öz dərsini ondan alacaq...
Var olsun kamalın, bir də qüdrətin,
Gül açsın daima saf məhəbbətin!

*1943, 26 mart*

## GƏLƏCƏYİN TOY-BAYRAMI

Bu gün-sabah al geyəcək təbiətin ilk baharı,
Yenə qönçə tutacaqdır könüllərin arzuları.
Yenə gəlin camalını açacaqdır bizim dağlar,
Bu ellərin sinəsindən gedəcəkdir odlu dağlar...
Ana yurdun hər yerindən kəsiləcək yad ayağı,
Açılacaq dərdlilərin bulud almış qaş-qabağı;
Yuvasından ayrılanlar tapacaqdır yuvasını,
“Oxxay!” deyib udacaqdır öz evinin havasını,
Yandıracaq öz əlilə yenə sönmüş çırağını,
İgidlər də boşaldacaq tüfənginin darağını...
Yenə həyat öz atını çəmənlərdə sürəcəkdir,
Yenə insan tay-tuşunu öz yanında görəcəkdir.
Uzaq deyil, bu gün-sabah görəcəyik o günləri,
Yenə qanad açacaqdır eşq adlanan gözəl pəri.
Yenə gənclik duyacaqdır məhəbbətin xoş dadını,
Analar da tapacaqdır itkin düşmüş övladını.
Üz-gözündən öpə-öpə öz bağrına basacaqdır;
Bu səhnəyə yerlər, göylər baxıb qulaq asacaqdır.
İlk baharda qalmayacaq son baharın xəzəlləri,
Yenə əlvan geyinəcək Ukraynanın gözəlləri.
Yaşıl bağlar tellənəcək banduranın xoş səsindən,
Yarpaqlara səs düşəcək ana yurdun nəğməsindən.
Salxım-salxım olacaqdır ağ üzümü tənəklərin,
Yelinləri dolacaqdır yenə sağmal inəklərin.
Yetkin, sulu meyvələr də sallanacaq budağından,
Qoca bağban gün doğmamış çıxacaqdır otağından.
Səhralara səs salacaq ilxıların kişnəməsi,
Qulaqları oxşayacaq qoyun səsi, quzu səsi.
Yenə axar çaylar üstdə dəmir körpü qurulacaq,
Yenə sahil lampaları alışacaq çıraq-çıraq.
Qatarlar da şahin kimi şığıyaraq tunellərə,
Xeyir xəbər aparacaq bu ellərdən, o ellərə...
Dağlar, daşlar titrəyəcək zavodların nərəsindən,
Sonsuz çöllər oyanacaq maşınların gur səsindən.

Bu gün qızıl qan içində rəngi solmuş hər biçənək
Sabah bahar günəşində sayrışacaq çiçək-çiçək.
Yad ayaqlar təpiyilə tapdalanmış qara torpaq
Öz başını sərv kimi sabah göyə qaldıracaq.
Yenə Krım göylərinin parlayacaq ulduzları,
Yenə yaşıl donlu dağlar geyinəcək toy paltarı.
Qara dəniz güzgü kimi parlayacaq başdan-başa,
Ağ dalğalar sıçraşacaq sahilləri daşa-daşa.
Qara gözlü tatar qızı seyrəngaha çıxan zaman,
Qurtuluşun şərqiləri yayılacaq dodağından.
Yenə dəniz sahilinin gülər üzlü xoş səhəri
Loğman olub sağaldacaq dərman üçün gedənləri.
Düzüləcək qatar-qatar Qara dəniz gəmiləri,
Bir də Kuban çöllərinin ipək telli zəmiləri.
Dəniz kimi dalğa-dalğa yenə ləngər vuracaqdır,
Qoca kazak yabasilə min bir taya quracaqdır.
Yenə aşıb-daşacaqdır sarı buğda anbarımız,
Yenə bizə qalacaqdır öz yerimiz, öz varımız.
Yurdumuzda nə bir yetim, nə də bir ac qalacaqdır,
Düşmənimin nəsilləri bizə möhtac olacaqdır.
Bir cənnətə dönəcəkdir bu gün yanmış xərabələr,
İnsanlığın şöhrətidir əzəl başdan böyük hünər.
Bu gün, yanmış sarayların hisli-paslı divarları
Yenə dümağ suvanacaq – budur elin öz qərarı!
Yenə böyük kaşanələr yüksələcək calal ilə,
İnsan oğlu! Zəhmətini öz yurduna halal elə.
Sən də tez ol, qoca memar, axıt yenə alın təri,
Qoy yenə də işıqlansın Yerusəlim məbədləri.
Gəl də onun hər naxşını öz əlinlə yenidən çək,
O gözəllik sənətinin çeşməsindən yenə içək...
O məbədin hər bir daşı min könülün sirdaşıdır,
Bizim bu "Qız qalası"nın bir ülviyyət qardaşıdır!

* * *

İllər gəlib dolandıqca qərinələr keçəcəkdir,
Bütün aləm qurtuluşun şərbətindən içəcəkdir.

Min bir kitab bağlanacaq yenə ömrün calalına,
Ulduzlar da baş əyəcək insanlığın kamalına.
Yer üzündə nə xəyanət, nə də iblis qalacaqdır,
Bütün həyat istisini bir günəşdən alacaqdır.
Bütün varlıq ruhlanacaq bir məbədin səcdəsindən,
Bütün qəlblər titrəyəcək bir kamanın xoş səsindən.
Bir ananın döşlərindən süd əməcək bütün bəşər,
Düşmən olub qalmayacaq tarix boyu xeyirlə şər.
Bir sevdanın məhəbbəti düşəcəkdir ürəklərə,
Bircə günəş nur səpəcək arzulara, diləklərə.
Bayrağını qaldıracaq azad könül, azad vicdan,
Vaxtsız ölüm ac gözünü çəkəcəkdir qapılardan.
Ağıl deyir qalmayacaq yer üzündə qandan əsər,
Hər könülə ilham kimi güləcəkdir gözəl səhər.
Güləcəkdir insan ömrü, onun tərlan xəyalları,
Bir də çovğun görməyəcək səadətin ilk baharı...
Bu nizələr, bu süngülər muzeylərdə pas tutacaq,
İnsan oğlu yaratdığı dəhşətləri unudacaq.
Qalmayacaq nə riyasət, nə paxıllıq, nə də bir kin,
İnsan əli pozmayacaq novrağını təbiətin...
Yenə günəş öz atını yəhərləyib asimanda
Toy xəbəri yayacaqdır gah o yanda, gah bu yanda.
İnsan qonaq gedəcəkdir ulduzların məclisinə,
Dünya qulaq verəcəkdir kainatın ney səsinə.
Ulu Hürmüz öz taxtını bəzəyəcək şəfəqlərdən,
O, azadlıq pərisilə səsləşəcək ilk səhərdən.
Yer kürəsi başdan-başa al şəfəqə boyanacaq,
Dağlar, daşlar yuxusundan şirin-şirin oyanacaq.
Ulu Hürmüz Əhriməni öz əlilə boğacaqdır,
Hər könülün öz muradı, öz günəşi doğacaqdır.
O vaxt bütün qaranlıqlar əriyəcək başdan-başa,
Ömür abad olacaqdır, könül mülkü bir tamaşa.
Nə ayrılıq qalacaqdır, nə intizar, nə göz yaşı,
Hər addımda könül dostu, hər baxımda can sirdaşı.
Tarix gəlib qovuşacaq ən müqəddəs bir niyyətə,
Biz indidən söz qoşuruq o ilahi şeriyyətə.
Hər dövranın bir hökmü var, hər zamanın bir qələmi

Xəyal deyil, röya deyil gələcəyin o aləmi...
O aləmin bayrağını biz görürük al qırmızı,
Fərhad kimi külüng vuran insan oğlu, insan qızı
O aləmin sevgisilə cəbhələrdə sinə gərir,
Alovların qucağından gələcəyə yol göstərir.
Alqış Vətən torpağını candan əziz bilənlərə!
Alqış olsun həyat üçün döyüşlərdə ölənlərə!
Alqış səbri tükənməyən ağ birçəkli analara!
Vətən mülkü məhəbbətlə çıxacaqdır ilk bahara.
O baharın hər məclisi qurulacaq ürəklərdən,
Gəlin kimi tac qoyacaq öz başına çiçəklərdən.
Alqış bizim getdiyimiz bu dediyim gələcəyə!..
Bizim Odlar ölkəsi də mahnısını deyə-deyə
Öz şerinin nəfəsilə yaşayacaq o zamanda;
Dədə Qorqud dediyimiz min bir yaşlı bir ozan da,
Qoca vaxtı öz sazını sinəsinə basacaqdır,
Bütün xalqlar və tayfalar ona qulaq asacaqdır.
O açacaq dəniz kimi tükənməyən ağılını,
Söyləyəcək öz yurdunun qəhrəmanlıq nağılını.
O, məclisə can verəcək ayın, günün camalilə,
Azərbaycan torpağının dərya boyda kamalilə.

*1943*

## İLHAM PƏRİSİ

Sənin həyat dəftərindən nə dövranlar gəlib keçdi,
Sənin sənət bulağından neçə nəsil şərbət içdi!..
Ayağını qoyan gündən bizim doğma səhnəmizə,
Əksimizi güzgü kimi düz göstərib açdın bizə.
Bizim doğma səhnə! – dedim, məncə, bu söz müqəddəsdir.
Məncə, bizi yaşadan da bu məhəbbət, bu həvəsdir!
Sənət nədir? O həyatın qaynar axan çeşməsidir,
O zamanın gözümüzdən lenta kimi keçməsidir...
O müzəyyən bir aləmdir... Hər tərəfi şölə çıraq,
O aləmdən nur tökülür hər vicdana qucaq-qucaq.
Bizim sənət doğrudan da ayın, günün camalıdır,
Dünya görmüş bir millətin qızıl tacı, kamalıdır.
Ondan doğur qəlbimizə gülər üzlü min bir səhər,
Açır bizə qucağını saf eşqlər, məhəbbətlər.
Baxıb gözəl səhnəmizə anlayırıq özümüzü...
Yurdumuzun üzü kimi, səhnəmizin safdır üzü.

Sən səhnədə saç ağartdın, doğrudan da sənətkarsan,
Sən daima ətir saçan, güllər açan bir baharsan.
Ürəkdəndir tərpənişin, könüldəndir danışığın,
Sən ilhamın qüdrətinə doğrudan da möhkəm sığın!
İlham sənət rübabıdır, sim istəyir bizdən o saz...
O bir dövlət quşudur ki, hər eyvana uçub qonmaz.
Qoy ilhamsız yaradanlar bir utansın bu dünyada,
Alqışlara aldanmayaq, alqışlar da gedər bada.
Sənət hünər meydanıdır, qoy pələnglər addım atsın,
Mən istərəm filosoflar səhnəmizə söz yaratsın.
Fikri, qəlbi dayazların xəyalatı dayaz olar,
Əsərinin mənası da özü kimi bir az olar.
Dar meydanda aslanın da zəncirlənər əl-ayağı,
Qələmlərin qüdrətilə çiçəklənməz sənət bağı.
Sən də, yoldaş tamaşaçı! Sən də mənə bir qulaq as!
Zövqü sadə gülüş bilmək heç bir kəsə əfv olunmaz.
Hər ötərgi lağlağıya söylə, neçin əl çalırsan?

Neçin tərlan ovlağından sən yerlərə alçalırsan?
Öz qəlbinin otağında sən də qartal eşqi bəslə!
Sən gözünü günəşə dik, ulduzları yerə səslə!
Ucuz-ucuz alqışlardan yorulmasa o əllərin,
Qanad açıb qalxmayacaq göy üzünə əməllərin.
Gəlin dostlar, səhnəmizin söz tacına kamal verək!
Min gözəllik heykəlilə bu dilbərə camal verək!
Qoy var olsun böyük qəlbin, böyük fikrin hər neməti,
Bizim Odlar ölkəsinin şeir, sənət məhəbbəti!

*1943*

## MƏNƏ BELƏ SÖYLƏYİRLƏR...

Görüb tanış olmadığım,
Qayğısına qalmadığım
Şeir dostu bir insandan
Bir xatirə söylədilər.
“Bizim elli bir qəhrəman –
Bir yaralı qızıl əsgər
Son nəfəsdə səni andı,
Dəniz kimi dalğalandı...
Dedi: “Doktor! Aman, doktor!
Sağlığıma güman yoxdur...
Bıçağını saxla bir dəm,
Bilirəm ki, öləcəyəm...
Gözüm yolda, könlüm səsdə,
Dinlə məni son nəfəsdə.
Qoy Vurğunun sözlərindən
Bir bənd deyim son dəfə mən;
Sən də eşit bu nəğməni,
Qoy dolaşsın o, aləmi:
“El bilir ki, sən mənimsən,
Yurdum, yuvam, məskənimsən,
Anam, doğma vətənimsən,
Ayrılarmı könül candan?
Azərbaycan! Azərbaycan!”
Deyib bu son sözlərini,
Yumdu qara gözlərini...”
Daha bəsdir, dayan bir az!
Yaman xəbər uzun olmaz...
Yaxşı bilir bunu aləm
Mən ağ günlər şairiyəm.
Ancaq yaman bir xəbərdən
Dəniz kimi bulannam mən...
Açılmayır qaş-qabağım
Ağır aylar, illər kimi;
Çiçək açmaz könül bağım
Susuz qalan çöllər kimi.

Aylar keçir bu söhbətdən,
Canımda bir külək əsir.

Düşündükcə, duyduqca mən
Bütün aləm qulaq asır...
Hara getsəm, nəyə baxsam,
Yerə baxsam, göyə baxsam,
Görmədiyim o qəhrəman
Gözlərimə baxır hər an...
O mənimlə qoşa gedir,
Nəsə məndən tələb edir...

***

Gözəl dost, dinləsin qoy məni aləm!
Bu şeir qəlbimdən qopan bir səsdir,
Sənin eşqin kimi bu müqəddəsdir.
Bəzən yaşa dönür gözlərimdə qəm...
Sən ki son nəfəsdə Vətəni andın,
Çayların axını dayandı bir an.
Sən ki, eşq oduna mərdanə yandın,
Simanı görürəm mən alovlardan...
Görürəm daima qartal sinəni,
Bir də o mehriban, o saf üzünü.
Qoynunda gəzdirsin ulduzlar səni,
Yazsın asimana ayaq izini...
Yox, yox! Ulduzlar da yerdən uzaqdır,
Adını göylərə yazmayacaqdır...
Yenə də insana yaraşır ilqar,
O məsum heykəlin qarşımızdadır.
Bizdən ayırdısa səni ruzigar,
Yenə hünər tacın başımızdadır!

Qardaşım! Görürəm dağlardan keçən
Yaşıl dolaylarda ayaq izini.
Görürəm eşqinlə gözü yol çəkən
Dağlar gözəlini, dağlar qızını.
Budur, dünya görmüş o qarıya bax,
Mənalı gözləri intizardadır.
Ağarmış saçları həsrətdən dümağ
Ömrü xəzəl kimi son bahardadır...
Lakin sinəsində döyünür ürək,
Hər şey öz suyunu ürəkdən içər...

Ana intizarla pəncələşərək,
Deyir: “Güləcəkdir üzümə səhər”.
Ümid! Mehribandır o gözəl pəri,
O bizə dar günün kömək əlidir.
O insan qəlbində yanandan bəri,
Qaranlıq yolların bir məşəlidir!

Bu gün cəbhələrdən qayıdıb gələn
Bir vətən oğlunun sıxdım əlini.
Onun gözlərində seyr elədim mən
Sənin o müqəddəs, pak əməlini...
Bəzən axşam üstü gəlirəm evə,
Yalnız buraxmayır xəyalın məni.
Öpdükcə oğlumu mən sevə-sevə,
Onun gözlərində görürəm səni...
İllər gəlib keçir, dövran xoş gəlir,
Ağ günə qovuşur yenə də Vətən.
Səadət eşqinə məclis düzəlir,
İnsanlar dil açıb danışır səndən.

Budur, gözlərimdə gülür gələcək,
Qarşımda möhtəşəm bir heykəl durur...
Ətrafı bağçadır, yeri gül-çiçək,
Yanında göylərə fəvvarə vurur,
Baxır dəstə-dəstə insanlar ona.
O kimdir? O adsız bir qəhrəmandır.
Onun ana qəlbi – indi zamandır!
Alqış zamanının əsil oğluna!
Sən öldün ömrünün gənclik yaşında,
Adın səadətə yazıldı sirdaş.
İndi heykəlinin mərmər daşında
Sənin son sözlərin yazılmış, qardaş:

“El bilir ki, sən mənimsən,
Yurdum, yuvam, məskənimsən,
Anam, doğma vətənimsən,
Ayrılarmı könül candan?
Azərbaycan! Azərbaycan!”

*1943, 26 may*

## BAYRAQDAR

### I

O zaman ki, insanların
Yurd-yuvası oda yandı,
Axıb gedən al qanların
İntiqamı alovlandı.

O zaman ki, qılınclar da
Sığışmadı öz qınına,
Biz and içdik ilk baharda
Gözəlliyin varlığına.
Biz and içdik gen dərələr,
Sıra dağlar qucağına;
Biz and içdik səhər-səhər
Babaların ocağına.
Alay-alay, qatar-qatar
Qəhrəmanlar çıxdı yola;
Torpaq dedi: sahibim var,
Göy kişnədi: uğur ola!
Axar çaylar öpdü o gün
Atlıların ayağından.
Bir zəlzələ qopdu o gün
Hər könülün otağından.

### II

Yaraqlandın o gün sən də,
Səsin düşdü dağdan-dağa,
Boran qopub, yel əsəndə,
Göydən alov yağa-yağa,
Daşlarından tüstü qalxan
Cəbhələrə sən də vardın,
Azərbaycan torpağından
Hünər ilə ad apardın!

### III

Gecə zülmət, üfüq qara,
Çatılmışdır alnı göyün.

Yerin bağrı düyün-düyün,
Meydan olmuş hücumlara,
Gecə zülmət, üfüq qara.

Nələr görür tarix, nələr!
Uçur tanklar, təyyarələr.
İgidlərin nərəsindən;
Yerin, göyün nəfəsindən
Barıt yağır, tüstü yağır...
Bütün aləm üzür qanda.
O qocaman asiman da
Nəfəs alır ağır-ağır...

Zəncirlidir qoca qartal,
Qanadları qəfəsdədir.
Qəmli gözlər yol üstədir.
"Gəl! Gəl! – deyir – intiqam al!
Gəl ki, ömrüm qaldı darda!
Rəngim solur intizarda;
Hanı mənim azadlığım?
O məclisim, o şadlığım?
Hanı dostlar, o həmdəmlər?
Gələcəkmi keçən dəmlər?
Gələcəkmi xilaskarlar?
Gələcəkdir! Ümidim var!"

**IV**

Yer tərpənir, göy çaxnaşır,
Hücum çəkmiş qəhrəmanlar.
Dəniz kimi coşub-daşır
Zirehlənmiş pəhləvanlar.
Zalım düşman! Zalım düşman!
Boz sifəti soyuq qışdır;
O kor kimi yapışmışdır,
Kor ölümün yaxasından.
Həmdəmidir fəlakətlər,
Bir ölümdür onun varı,
Ondan qaçır səadətlər,
Həyat sevir canlıları...

Faşist gəlir donuz kimi,
Yaralanmış quduz kimi,
Dörd tərəfi o dalayır,
Daşlar üstə qan yalayır.
Gəlir tanklar, təyyarələr,
Səsə düşür dar dərələr.
Qılınclar da üzür qanda,
Ölən də var, yıxılan da.
Dəqiqələr tez ötüşür,
Yaxın dostlar ayrı düşür.
Biri deyir: – yaralandım.
Biri: – yardan aralandım.
Biri ölür ilk gülllədən,
Yuvarlanır son pillədən.
Başqasının alnı qanlı,
Polad köksü üç nişanlı,
Meydan deyir qaranlığa,
Dayanmadan bir anlığa!
Deyir: "Yoldaş, qorxma məndən,
Qorxma, məni qan aparmaz.
Mən dayanıb dursam bir az
Ayaqlanar qarı düşmən.
Gəlin, dostlar, son hücuma
Şahin kimi cuma-cuma!.."
İsti qanlar yerə hopur,
Qılınclardan alov qopur.
Ac topların titrəməsi,
Mərmilərin qorxunc səsi
Lərzə salır dörd bir yana,
Oğul istər bir dayana,
Keçir dostlar son hücuma,
Şahin kimi cuma-cuma!..

**V**

Düşmən qaçır, yaman qaçır,
Ölən ölür, qaçan qaçır.
Dayan, cəllad! Yol bağlıdır,
Daş torpaq da yaraqlıdır.

Vaxtsız ölən ömrün kamı,
Anaların intiqamı
Bir ümmandır dalğalanır,
Hər könüldə bir dağ yanır...
Ancaq faşist duyğusuzdur,
İlan kimi canı buzdur;
O ölsə də son nəfəsdə
Gah qıvrılır, gah burulur,
O qaçdığı yollar üstdə
Hər yuvaya bir od vurur.
Yanır evlər, göylərə bax!
Tüstü qalxır qalaq-qalaq
Yanır anbar, yanır zəmi,
Çay üzündə süzən gəmi;
Yanır gözəl abidələr,
Min bir əməl, min bir əsər.
Min bir uşaq, qoca qarı
Ayrı düşür yuvasından...
Tez söndürün yanğınları!
Onların pis havasından
Saralmasın göy çəmənlər,
Qərənfillər, yasəmənlər.

**VI**

Aha, gəldi bizimkilər;
Gülür günəş, gülür səhər
Döyüşdükcə qoca qartal,
Qanadları qüvvət alır
Zəncirləri qırıb dərhal
Gövdəsindən yerə salır...
Əllərində gül-çiçəklə
Yol üstünə çıxır ellər.
Bir diləkli min ürəklə
Alqış deyir bütün dillər.
Keçir bizim qəhrəmanlar
Alay-alay, iftixarla,
Qəh-qəh çəkib gülür onlar
Dağlar boyda bir vüqarla...

### VII

Qara gözlü, qara qaşlı,
Laçın boylu tankçıya bax!
Sevincindən gözü yaşlı,
Bir ev üstə dırmaşaraq,
Al bayrağı ora taxır,
Bütün şəhər ona baxır.
Qurtuluşun al səhəri,
Dan yerinin şəfəqləri
Öpür onu ana kimi.
Azadlığın böyük qəlbi
Qartal kimi qanad açır,
Günəş kimi şəfəq saçır.
Kimdir həmin qara gözlü,
Laçın boylu, gülər üzlü,
Sevdiyimiz o qəhrəman?
Ad verdimi ona zaman?
O igidin tunc sinəsi
Bir Koroğlu qalasıdır.
Qulağıma gəlir səsi,
Azərbaycan balasıdır!
Sən müqəddəs bir diyarda
Öz könlünü bəsləmisən...
Bizim yalçın qayalarda
Tərlanları səsləmisən.
Sən bir eşqin, məhəbbətin
Çiçək açmış baharısan!
Sən ağ saçlı bir millətin
Şöhrətisən, vüqarısan!
Qocaman rus şəhərinə
Qardaş kimi ayaq basdın.
Azadlığın səhərinə,
Günəş rəngli bayraq asdın.
Qoy var olsun o mərd əlin!
O saf eşqin, saf əməlin.
Düşəcəkdir dildən-dilə,
Gəzəcəkdir əldən-ələ.

*1943, 1 sentyabr*

## GÖYƏRÇİN

Ukraynanın son baharı;
Yağış yağır narın-narın.
Sapsarıdır ağacların
Xəzəl olmuş yarpaqları.

Yerin bağrı zolaq-zolaq,
Qılınc kimi kəsir külək.
Pərişandır qara torpaq,
Nə bir gül var, nə bir çiçək.

Kənd biçimli bir şəhərin
Lövhəsini çəkirəm mən.
Uzun-uzun küçələrin
Səs gəlməyir heç yerindən.

Burda nə bir insan səsi,
Nə bir bağça, nə bir bağ var.
Nə mal, qoyun mələşməsi,
Nə də isti bir ocaq var!

Hara baxsan, nəyə baxsan,
Sanki bütün dünya laldır...
Yaranmamış, bəlkə, insan
Bəlkə, ömür bir xəyaldır?

Diksindirir məni bəzən?
Yaxındakı topun səsi.
Keçir başım üzərindən
Mərmilərin kişnəməsi...

Qanla yazır min bir əsər
Fəlakətin bir anlığı...
Təngimişdir dar üfüqlər,
Çökür axşam qaranlığı!

Sükunətin qəlbi qurşun, –
Asılmışdır qulağımdan!..

Dinlə, şəhər, məni bir an,
Söylə sənin bu duruşun
Dost qəlbinə nələr deyir?
Hansı şair, hansı şeir
Baxıb sənin bu qəminə,
Dalmış könül aləminə?..

Danışmayır, susur şəhər...
Nələr deyir xərabələr?!
Talan olmuş gözəl Vətən,
Nə bir dövlət, nə var qalmış.
Oda yanmış hər bir evdən
Quruca dörd divar qalmış.
Budur, bir ev yanında mən
İxtiyarsız dayanmışam...
Qanadını gərir axşam,
Soyuq keçir ürəyimdən.
Qapıdakı bir ağac da
Yarpaq töküb qurumuşdur...
Qərib qalmış o ağacda
Bir göyərçin oturmuşdur.
Aç dərdini, mehriban quş!
Sənin də öz lisanın var.
De, boynunu acı ruzgar
Yetim kimi niyə burmuş?
Qəm süzülür gözlərindən,
Söylə dərdin intizarmı?
Nə tutmusan qəlbində sən?
De, dostundan xəbər varmı?
Aç sirrini, de, göyərçin,
Nisgillisən söylə neçin?
Nə baxırsan yana-yana
Külə dönmüş o eyvana?
Söylə hanı səhər-səhər
Bu eyvana ayaq basan,
Təbiətə qulaq asan
O xoş üzlü, gözəl dilbər?

Onun şair qəlbi varmış,
O sevərmiş təbiəti,
Günəş belə salamlarmış
O qızdakı şeriyyəti.
Bu eyvanda o saf pəri
Çox vaxt roman oxuyarmış.
Arabir də ağ əlləri
İsti corab toxuyarmış.
Baş yaylığı al qırmızı
Səhərlərin dilbər qızı –
O dediyin gözəl hanı?
Neçin onun bu eyvanı
Yanıb soyuq külə döndü?
Yoxsa o saf məhəbbətdən
O könüldən, o ülfətdən
Dövranınmı üzü döndü?

Ah, o bir də gəlməyəcək
Bu bağçaya, bağa sarı;
Ona baxıb gülməyəcək
Bu albalı ağacları...

Qərib-qərib tək dayanma,
O dilbərin həsrətinə.
Ey göyərçin, çox da yanma
Can evinin möhnətinə!
Ah, o gözlər, ala gözlər!
Bir də səni görməyəcək,
Ətəyində səhər-səhər
Dostuna yem verməyəcək!
Bir gül kimi onu tufan
Budağından qoparmışdır.
O varlığı acı dövran
Bir heçliyə aparmışdır...

Dilə gəlir göyərçin də:
"Yaman olur hicran dağı;

O daş altda, toz içində
Bir romanın son varağı
O gözəldən yadigardır!..

Ən uğursuz bir zamanda
O dilbər də, o roman da
Yanıb getdi varaq-varaq...
Sən uğursuz taleyə bax!
Gör nə yaman hökmü vardır!”
Çox ağlama, zavallı quş!
Dediklərin daha bəsdir.
Yaraların bərk vurulmuş,
Dünya sənə bir qəfəsdir!
Yaxınlaşır yenə də qış,
Özünə bir aşiyan qur.
Gedən geri qayıtmamış –
Təbiətin hökmü budur.
Tarix adlı carçıya bax,
Gör nə deyir onun səsi:
– Bu gün-sabah qurulacaq
Bir ədalət məhkəməsi.
Dəyişəcək o gün dövran;
Bu zillətlər, bu möhnətlər
Vaxtsız ölmüş məhəbbətlər
Baş qaldırıb torpaq altdan,
Hayqıracaq qisas deyə,
Hökm edəcək yerə, göyə.
O gün məlun cinayətkar
Asılacaq boğazından.
Qalmayacaq nə intizar,
Nə bir məhbəs, nə bir zindan!
Əynindən yas paltarını
Soyunacaq qara torpaq.
O qurtuluş baharını
İnsan oğlu yaradacaq!

*1943, 13 noyabr*

## ADSIZ QƏHRƏMAN

Bu gün şəndir xəstəxana, baxışlarda bir sevinc var,
Ağrısını unutmuşdur bir anlığa yaralılar.
Dalğalanır tarın səsi –
Qarabağın şikəstəsi

Bizim yalçın qayalardan xəbər verir xəstələrə...
Dumanlı dağ, sulu dərə.
Axar çaylar, göy çəmənlər yada düşür yenə bir-bir,
Ağır gündə xoş xatirə insan üçün təsəllidir...

Rəqqasə də kəklik kimi süzüb gedir çəmənliyə,
Hər könüldən bir səs gəlir: "Ölməmişəm, sağam!" – deyə. –
"Gözlə məni, nişanlı qız, taleyimin hökmü budur!"
Bizim qızlar öz andını, öz eşqini gec unudur.

"Gözlə məni, zaman gələr görüşərik ilk baharda
İpək telli çiçəklərin sayrışdığı çəmənzarda.
Yenə ayaq izlərimiz qoşa qalar, gözəl nigar!
Qoynumdakı güllü yaylıq – sən verdiyin son yadigar.

Eşqimizin uğurunda boyanmışdır öz qanıma,
Bu bir qanlı səhifədir mənim həyat dastanıma".
Bu xəyalla bir çoxunun gözlərindən ümid yağır
Çoxları da bu həsrətlə nəfəs alır ağır-ağır...
Son baharın şöləsini pəncərədən günəş yayır,
Ölən ölür, qalan qalır, saydığını zaman sayır...
Nəğmə uçur, əl çalınır, gözlər gülür səadətlə,
Həyat eşqi qayıq kimi pəncələşir fəlakətlə!

– Çalın! Çalın! Ana yurdun havasını biz uduruq,
Çəkdiyimiz ağrıları, zillətləri unuduruq...
Bir ağız da, bir nəfəs də danışdırın sarı simi,
Belə bir gün ələ düşməz, dayanmayın qonaq kimi.

Çalğı çalır, sonra şair sinəsindən sözlər deyir,
Hər məclisə yaraşıqdır gözəl kəlam, gözəl şeir.
Lakin orda... bir bucaqda ayrıca bir çarpayı var,
Pərişan bir asimandır! Nə ulduzu, nə ayı var.
Orda yatan bir günəşin göz qapağı qaralmışdır,
Nə səsi var, nə səmiri, son nəfəsi daralmışdır...

Kamançanın, tarın səsi,
Ana yurdun xoş nəfəsi

Artıq ona yad kimidir! Mən duyuram bu möhnəti,
Son baharın sərt küləyi qamçılayır təbiəti.
– Din, qardaşım, adın nədir?
Bəlkə bizə bir sözün var?
Xeyr! Gecdir bu suallar!..
O hər şeyə biganədir.
O duymayır, eşitməyir dostlarının fəryadını,
Heç olmasa, şairə də söyləməyir öz adını.
Ayın, günün camalına baxmayacaq o bir daha,
Baxmayacaq gülər üzlü, ipək telli xoş sabaha.
İnsan ömrü şirin olur, o ayrıldı bu nemətdən.
O, dünyada kam almadı uğurlu bir məhəbbətdən.
Vaxtsız ölüm, vaxtsız ölüm, gedər-gəlməz bir yolun var!
Baxıb sənə lənət deyir həyat üçün yaranmışlar.
Sənin qanlı qılıncınla bu dünyadan canlar gedir.
Mən duyuram bu möhnəti, ürəyimdən qanlar gedir.
Sən ey, gözü yol üstündə boynu buruq duran pəri!
Sədəf kimi sayma, quzum, gəlib keçən bu günləri.

Boğulmasın titrək səsin,
Saçlarına dən düşməsin.
O bir daha gəlməyəcək!
O səninlə gəzib qoşa,
İndən belə dağa, daşa
Ayaq basa bilməyəcək!

Siz ey, Odlar ölkəsinin adsız ölən ərənləri!
İnsan oğlu bu aləmə göz açdığı gündən bəri
Azadlığın məşəlinə qurban olmuş pərvanə tək...
Lakin ellər baş endirir qəhrəmanlar güzarına!
Adsız ölən igidlərin o pərişan məzarına
Çiçək səpir qucaq-qucaq, gül dağıdır ətək-ətək.
Siz ey, vətən torpağının vaxtsız ölən övladları!
Ey ağ saçlı bir millətin baş şöhrəti, dünya varı!

Alqış deyir tarix sizə!
Bu şerim də yollar açsın,
Günəş kimi şəfəq saçsın
O müqəddəs qəbrinizə!

*1943, 15 noyabr*

## QƏZƏL

Ey könül! Min namə yaz bir gülüzarın eşqinə,
Can evindən seyrə çıx bir xoş güzarın eşqinə.

Hansı rəssamın əlilə canlanır dünya evi?
Hər çəmən min qönçə açmış novbaharın eşqinə!

Gəl, gəl, ey sevdalı bülbül, gəl gəzək gülşənləri,
Sən gülün eşqilə dillən, mən də yarın eşqinə.

Məcnun öz şurilə çox da aləmə səs salmasın,
Hansı namərd can əsirgər bir nigarın eşqinə?

Gün keçir, dövran keçir... Öz hökmünü vermiş zaman;
Ney tutulsun, badə gəlsin ruzigarın eşqinə!

İnsan oğlu can verər pərvanətək atəşlərə
Düz sözün, düz ilqarın, düz etibarın eşqinə!

Vurğunun öz aləmi, öz qəlbi, öz ilhamı var
Mehri-ülfətdən yaranmış bir diyarın eşqinə!

*1943, noyabr*

## ÜRƏK

### I

Bir incik dost kimi gileylənərək,
Bu axşam dil açdı sinəmdə ürək:
“İyirmi ildir ki, qələm çalırsan,
Yerdən də, göydən də ilham alırsan;
Başında rəqs edir od da, şimşək də,
Şerinə ruh verir gül də, çiçək də,
– Baxıb təbiətin min nemətinə,
İnsan nəfəsinin şeriyyətinə,
Dağlardan tökülən şəffaf sulara,
Dalğın xəyallara, saf duyğulara,
İnsan qayğısına, qəmə, möhnətə,
Şərəfə, izzətə, eşqə, hörmətə,
Min bir xatirənin sirli səsinə,
Keçən tarixlərin faciəsinə,
Gələcək günlərə şeir demisən.
Dövran da sürmüsən, qəm də yemisən.
Bəs söylə, şairim! Söylə bir görək,
Gecə də, gündüz də hey döyünərək,
Ömründə rahatlıq görmədən bir an,
Köksün qəfəsində dustaq yaşayan,
Dünyada gözünə yuxu gəlməyən,
Bircə an dayanıb heç dincəlməyən,
Sənin bədəninə qızıl qan verən,
Şair varlığına həyəcan verən
Vəfalı bir dostu unutdunmu sən?
Mən ki doymamışam öz ilk eşqimdən!
Mənim öz andım var, öz ilqarım var,
Ölüm gününədək etibarım var.
Hər şeyə ad verdin sən bu dünyada,
Nə olar, məni də salasan yada?
Nə olar, bir danış, ey nankor insan!
Bir şerin adını ürək qoyasan!

Qoy mənim adım da qalsın yadigar,
Boynunda bu qədər haqqı-sayım var!..”
Ürək bu sözləri danışıb susdu,
Elə bil sinəmdə qızıl qan qusdu.
Könlümün evində bu axşam, düzü,
Şeir pərisinin pərişan üzü
Bir aya bənzədi – camalı solğun,
Bir qıza bənzədi – gözləri dolğun.
Bu dəm bir ağrı da gəldi başıma,
Üz tutub, dil açdım can sirdaşıma:
“Ey ürək dediyim vəfalı pəri!
Sənin söylədiyin bu töhmətləri
Eşidə bilsəydi, əriyərdi dağ...
De görüm, mən səndən dönmüşəm haçaq?
Biz ki, yetimliklə böyüdük qoşa,
Birgə qonaq getdik yara, yoldaşa.
Dağları, düzləri gəzdik piyada,
Ancaq başımızı əymədik yada...
Bəzən ac da qaldıq, susuz da qaldıq,
Alıb qəm sazını birlikdə çaldıq.
Bəzən də atlanıb cıdıra çıxdıq,
Ağ günlər əsrinin əlini sıxdıq.
Səni balam kimi bağrıma basdım,
Sənin hər ağrına mən qulaq asdım.
Mən səni vermədim soyuğa, yelə,
Sənsiz dolaşmadım bir addım belə;
De, hansı məclisdə sənsiz oturdum,
Bir aşiyan tikib, bir yuva qurdum?!
De, hansı şerimi yaratdım sənsiz?!
Sənsiz yaradanlar ölər vətənsiz!
Sən də öz eşqinə nankor olmadın,
Şerdən, sənətdən ucadır adın,
Ürəksən, əsirin olmuşdur aləm;
Nə yazsın şəninə zəif bir qələm?
İndi ki, yaz deyə, əmr eləyirsən,
Buyruq səninkidir, öz qulunam mən.

Adına bağlayım bir yeni dastan,
Bir yığın sümükdür ürəksiz insan”.

## II

Bir ovuc damarsan, bir parçacıq ət,
Bir nemət yaratdı səni təbiət.
İnsana can verən ruh verən sənsən,
Həyat aşiqisən, ömür sevənsən.
Dillər dastanıdır mehribanlığın,
Sən mehrin, ülfətin, pərişanlığın,
Ümidin, nəşənin, eşqin, vüqarın,
Alovlu, şimşəkli ehtirasların
Bir ilk beşiyisən, ilk anasısan!
Sənin qüdrətinlə yaşayır insan.
Sənsən bu dünyada ən yaxın həmdəm,
Sənin övladındır hər nəşə, hər qəm!
Hər batan axşamın, doğan səhərin,
Gələcək günlərin keçən günlərin,
Hər toyun, bayramın, hər səadətin,
Min bir fəlakətin, min bir möhnətin
Xatirə dəftəri sən deyilmisən?
Keçdiyim yolların şahidiyəm mən!
Nə olsun ki, yuvan çox qaranlıqdır?
Şöhrətin günəşlə qəhrəmanlıqdır.
Köksünü aləmə gərəndən bəri,
Köhlən bir at kimi getdin irəli...
Sıldırım dağlarda, qayalıqlarda,
Ayazda, şaxtada, boranda, qarda,
Bütün təbiətlə üz-üzə gəldin,
Əridib gecəni, gündüzə gəldin!
Ayazda donmadı sənin nəfəsin,
Tufanda batmadı eşqin, həvəsin.
Dünyada düşdünsə min qəmə, dərdə,
Qaranlıq çəkmədi gözünə pərdə...
Demə ki, bir ətsən, bir də ki, qansan,

Qüdrətin böyükdür, çünki insansan.
Varlığın nə zərif yarandı sənin,
Gözlə görünməyən bir aləmin var...
Sən həyat suyusan ruhla bədənin –
Qoynunda bəslənir incə duyğular.
Bir insan oğluna üz verəndə qəm,
Səməndər quşu tək sən də yanırsan.
Tufanlar içinə düşəndə aləm,
Sən də dəniz kimi dalğalanırsan...
Əzəldən bəridir ürəkdir adın,
Köksün qəfəsində dustaq olmadın.
Vəfasız görəndə bir dostu, yarı,
Yanırsan aldanmış bir gözəl kimi.
Əsəndə dövranın acı ruzgarı,
Saralıb solursan bir xəzəl kimi.
O zərif tellərin kamana bənzər,
Düşmə çəngəlinə soyuq əllərin;
Hər anın bir böyük zamana bənzər,
Çünki beşiyisən saf əməllərin...
Ömrümüz keçdikcə tufan içindən,
Sən bir məşəl olub yolda yanırsan.
Bizi ülviyyətə çağırdıqca sən
Bəzən günəş kimi alovlanırsan.
Böyükdür cahanda eşqin, nifrətin,
Bəşər qüdrətidir, çünki, qüdrətin.

**III**

Yazıqlar olsun ki, ey təmiz ürək!
Bəzən yuva salır səndə xəyanət...
İlanlar, əqrəblər pəncələşərək,
Qiyamət qoparır başa, qiyamət...

Bəzən "mələk" kimi gülümsəyərək,
Sənə sirdaş olur həsəd ilə kin.
Sənsə aldanırsan, sadəlövh ürək.
Toruna düşürsən hər müsibətin.

İllər dolandıqca o sönük hisslər
Əridir dəmbədəm səni mum kimi.
O saf varlığını yeyir iblislər,
Əsir bahar yeli bir səmum kimi.

Bəzən də qədrini bilməyirik biz,
Deyirik: biz hara, intizam hara? –
Sərxoşluq eşqinə uyur nəfsimiz,
Ürək qurban olur ehtiraslara...

Yuxusuz gecələr... çılğın badələr,
Soldurur ürəyi qızıl gül kimi.
Yazıqda qalmayır taqətdən əsər,
Boğulur qəfəsdə bir bülbül kimi.

O səsli məclislər, o dəbdəbələr
Həris gözümüzə munis görünür.
Ağır bir yuxuyla keçir min səhər,
Ürək dil açır ki, gödəlir ömür!

Bəzən də ötərgi bir həyat qəmi,
Ürəkdə böyüyüb bir dastan olur;
Pərişan gəzirsən bütün aləmi,
Gözündə ilk bahar zimistan olur.

Ey müqəddəs həyat! Müqəddəs insan!
Sənə ilham verən yalnız ürəkdir.
Ayıl, məclislərin sərxoşluğundan, –
Ömür röya kimi boş keçəcəkdir!

Ey insan! Ürəyin qədrini bil ki,
Həyat çeşməsidir o müqəddəs su...
Ürək dəmir deyil, daş da deyil ki, –
Min bir muradı var, min bir arzusu!

Qoy nakam getməsin dünyadan o qız,
Dadsın hər arzunun yüz nemətini.

Ürək qocalmasın dünyada vaxtsız,
Aləmdə görməsin can möhnətini.

O bir şeirdir ki, ehtişamı var,
Sığışır qoynuna bütün təbiət...
Onun arzusudur gözəl duyğular,
O qandan yaranır şeirlə sənət.

Qulaq ver sözümə, ellər, obalar!
Mərhəmət, iltifat ürəkdən keçər...
Nə böyük hikmətlə demiş babalar:
"Hər şey öz suyunu ürəkdən içər!".

Ürəksiz əkilən yerlər saralar,
Şitillər boy atıb bağça-bağ olmaz,
Hər evi, qapını boran, qar alar,
İşıqlı, istili bir ocaq olmaz.

Ovçunun könülsüz atdığı güllə
Ya torpaq sovurar, ya gözdən itər.
Hər kimi dindirsən soyuq bir dillə
Baxıb yadlar kimi yanından ötər...

Varaqla tarixi, keçmişlərə bax,
Qəlbsiz izdivacdan xəyanət doğar.
Rəyasət, ehtiras düşgünü, ancaq,
Doğma balasını əlilə boğar!

Qulaq as, nə deyir, gör qərinələr,
Qulaq as bir daha könül mülkünə.
Ürəksiz yaranan hansı bir əsər
Yadigar qalmışdır sabahkı günə?

Zamanın fövqünə qaldıran bizi
Könül pərisinin qanadlarıdır.
Açsaq qapı-qapı xəzinəmizi –
Onun dövlətidir, onun varıdır.

Siz ey, ürək ilə alver edənlər,
Tarix tüpürəcək sifətinizə!
Ey bütün ömründə rəqəm güdənlər,
Elin haqqı-sayı haramdır sizə!

**IV**

Dostlar! Qapıları döyək ülfətlə;
Könüldən könülə yol açaq elçin.
Müqəddəs, ilahi bir məhəbbətlə
Bir də xeyirxahlıq qalacaq elçin!

Gəlin, təbib kimi hər nəbzi tutaq,
Dinləyək döyünən hər bir ürəyi.
Uzun nitqləri artıq unudaq,
İnsanın insana işdir köməyi.

Gəlin, bu torpaqlı evlərə girək;
Öpək hər çırağı, hər yanan şamı.
Hər duyan ürəyə bir salam verək,
Öz evində görsün qoy bizi hamı,
Öpək hər çırağı, hər yanan şamı.

O zaman qəlbini bizə el açar,
Öz ürək sözünü deyər doyunca.
Sədəf dəhanından yüz min dür saçar,
Üstü unlu olan hər arif qoca
Öz ürək sözünü deyər doyunca.

Yoxsa yetməyəcək kamala şair,
Quru bir taxtanı simsiz çalacaq!
Yüz kitab yazsa da insana dair,
Kim ondan dünyada bir həzz alacaq?
Quru bir taxtanı simsiz çalacaq!

Ey ürək! Yoruldu fikirdən başım,
Həm də ki, az qalır artıq səhərə.

Ey ömür yoldaşım, ey can sirdaşım,
Bayaq söylədiyin o töhmətlərə
İndi nə deyirsən?
                                        Çırpındı ürək,
Mənim sevgilim tək gülümsəyərək,
Boynuma sarıldı; sonra qol-qola
Səhərin eşqilə düzəldik yola.
Ana torpağımın azad elləri,
Qurbanı olduğum ceyran çölləri
Açıb qucağını, “gəl”, – dedi bizə, –
Ürəklə can deyək Vətənimizə!

*1943, 20 dekabr*

## DÖRD SÖZ

İnsan övladının asiman qədər
Ulduzu sayrışan bir lisanı var...
Bu möhtəşəm kitab, möhtəşəm əsər
Hər sözün başında bir aləm açar...
Budur; xəyal məni yerdən uçurur,
O mənə göylərdə aşiyan qurur;
Bürüyür dövrəmi saysız ulduzlar,
Başqa zövq alıram bu gün aləmdən.
Yox, ulduzlar deyil məni bürüyən
Sözlər məclisinin qonağıyam mən!

"Məhəbbət" sözü var bizim lisanda,
O, dağlardan axan bir şəffaf sudur.
Yaşını bilməyir onun zaman da,
Bəlkə də insanın ilk arzusudur!..

Varlığa güldükcə o gözəl bahar,
Çiçəklər, qönçələr açır hər dilək.
O ilham qızının ehtişamı var,
Qəlbə həyat verir gülümsəyərək.

Onun saf qəlbində nə qəzəb, nə kin,
Nə həsəd, nə də ki bir xəyanət var.
Mənim and içdiyim o məhəbbətin
Qəlbində müqəddəs bir əməl yaşar...
Eşqin ipək telli zərif qanadı
Zamanın fövqünə qaldırdı bizi...
Məhəbbət iblisə təslim olmadı,
Yaşatdı insanlıq şərəfimizi.
Məhəbbət hünərdir! Bu yüksək əməl
Bizim qismətimiz olmuş cahanda.
O könül yolçusu, mehriban gözəl
Min ürək fəth edir hər keçən anda...
Onun qarşısında diz çökür insan,

Qılınclı, qalxanlı qəhrəmanlar da.
Eşqin odlarından, alovlarından
Yanıb şölə çəkir asimanlar da...

“Səadət” sözü var bir də cahanda,
Səadət, o gözəl, o xoşbəxt səhər...
Tale ulduzu tək onu hər yanda
Daima izləmiş keçən nəsillər.
Səadət zamanla məkana bənzər,
Onun nə ölçüsü, nə hüdudu var.
Səadətlə doğan hər azad səhər
Xəyala bir yeni kainat açar.
Ah! Onun qucağı nə mehribandır,
Nə qədər məsumdur o saf dodaqlar...
“Yaşasın səadət! Yaşasın bahar!” –
Bu böyük şüarı verən zamandır.
Lütfkar yaranmış onun əlləri,
Daima ağ günə çağırır bizi;
Səadət qızının xoş əməlləri
Ölümdən qurtarır saf eşqimizi...

Bir də dilimizdə “Vətən” sözü var,
Ana qucağıdır bu ilahi söz...
Onun nəfəsidir böyük arzular,
Nə könül doymuşdur ondan, nə də göz.
Vətən döşlərindən bizə süd verir,
Həyat nemətidir bu şanlı torpaq.
Qulaq as, gör anan nə öyüd verir:
“Şərəflə, vüqarla yaşayın ancaq...”
Vətən, öz eşqilə o doğma ana
Xeyir-dua verir qəhrəmanlara.
Şəhid oğulları basıb bağrına,
Matəm də saxlayır axan qanlara...
Qadir yaranmışdır müqəddəs Vətən,
O böyük hakimin verdiyi qərar
Pozulmaz zamanın xatirəsindən,
Onun öz hökmü var, öz dünyası var!

“Zəfər” sözünün də vurğunuyam mən,
Günəşdən ucadır onun bayrağı!
Dönməz oğulların iradəsindən
Gəncləşir qocaman Vətən torpağı!
Kimin ki, adına yazılmış “Zəfər”,
Öpüb qucaqlayır onu səadət.
Müzəffər ordular vüqarla keçər!
Ölümdür cahanda dilsiz itaət.
Böyükdür “Zəfərin” çarpan ürəyi,
Qolunda el nəbzi vurur hər zaman.
Əssə də dövranın taun küləyi,
Var olsun odlardan zəfərlə çıxan!
Ucalsın, ey zəfər, qoy al bayrağın,
Səninlə fəxr edir anamız Vətən.
Sənsiz zəlil yaşar ana torpağım,
İnsanın şöhrəti, şərəfi sənsən!
Yaşasın Məhəbbət dediyim pəri!
Yaşasın Səadət, o yaz səhəri!
Yaşasın anamız müqəddəs Vətən!
Oyansın səhərlər Zəfər səsindən!

*1944, yanvar*

## İLK BAHAR VƏ MƏN

Yenə yaşıl don geyinmiş çəmənlər gülür,
Təbiətdən ilham alıb ötür qumrular,
Göyün zümrüd gözlərindən nurlar tökülür,
Öz gözəllik dastanını açır ilk bahar...

Bu müqəddəs təbiətin saf şeriyyəti,
İnsanlığı dəvət edir bəxtiyarlığa.
Loğman kimi nəfəs verir bütün varlığa
Günəş adlı bir təbibin böyük qüdrəti.

Torpaq qızır, qar əriyir, çaylar bulanır...
Gah seyrəlir, gah sıxlaşır, əlvan buludlar.
Qaraquşsa göy üzündə tənha dolanır –
Ucalmaq da bir aləmdir, öz büsatı var!

Bəzən ömrü izdihamlar alır qoynuna,
Dalğalarda qayıq kimi gəzdirir bizi.
Şirnikirik hər məclisə, uyuruq ona,
Xəyalatsız keçiririk günlərimizi...

Lakin eşit, nələr deyir sənə bu ömür:
"Ayın, ilin, günün belə öz sayı vardır.
Bu, taleyin gözlərinə çoxmu görünür?
De, dünyaya hünərindən nə yadigardır?"

Bu sualı verir mənə nazəndə bahar –
Bir bahar ki, qəlbi onun sənət səsidir.
Ürəyimdə min saz tutub ötən duyğular,
Yaşamağın, yaratmağın nəşidəsidir!

Bahar! Bahar! Ey günəşin sevdalı qızı!
Yay aləmə şəfəq rəngli gur saçlarını...
Öz alnına şərəf kimi yaz baxtımızı,
Yaşat böyük eşqimizin söz gülzarını!

Qoca çinar! Bir sığallan kəhriz başında...
Göy çəmənə xalı kimi öz kölgəni sər!
Qoy hüsnünə salam versin müqəddəs səhər,
Təbiətin çiçək açmış bahar yaşında!

Xoruz banı... Dan ulduzu... Şəfəqli ülkər
Vüqar ilə mən anıram ötən gəncliyi.
Zaman-zaman min büsatlı dünyaya dəyər –
Səssiz keçən bir axşamın qulaq dincliyi!

Yaşıl donlu dağlar döşü! Ey ağ çadırlar!
Dolaylarda ilxı görüb kişnəyən boz at!
Halal zəhmət, şirin yuxu, ətirli ruzgar,
İlk ilhamım, ilk sözümdür müqəddəs həyat!

Körpə əmlik, ala çəpiş, yelinli inək,
Sünbülləri dalğalanan o yaşıl zəmi.
Qabarlı əl... Açıq alın, o sağlam ürək...
Saymaq ilə bitən deyil ömrün aləmi!

Qurban kişi, qara torpaq, çalışqan kotan...
Sinəsindən sözlər qoşan Tükəzban qarı!
Qoy var olsun öz əlilə həyat yaradan,
Azad zəhmət dünyasının mərd insanları!

Zəhmət dedim. Sual verin, nədir bu zəhmət! –
Əvvəl başdan şirin ömrün bir şöhrətidir!
Qara torpaq üstündəki min nazlı nemət
Yaşamağın, yaratmağın ilk qüdrətidir!..

Yaşa bahar! Yaşa həyat! Yaşa, ey zaman!
Halal zəhmət şərəfini öz alnına yaz!..
Azad yaşar bu qüdrətə güvənən insan,
Nə düşmənə, nə də dosta o möhtac olmaz!

Ağ saqqallı, dünya görmüş Bəxtiyar kişi!
Bolluqmudur yurdumuzun bu ilki yazı?

Sinəndədir yerin sirri, göyün gərdişi,
Mən görürəm əlindəki köhnə dəryazı...

Alqış, sənin qollarına, qocaman hünər!
Nə gümrahsan, təbiətdə qocalmaz ürək...
Təslim olur dəryazına o göy biçənək,
Düzüldükcə qatar-qatar yaşıl pöhrələr!

Səninkidir o xotmalar, o şiş tayalar,
Səninkidir gecə-gündüz qaynayan tarla.
Dağ başından əzəmətlə baxan qayalar
Şöhrət tapır alnındakı o saf vüqarla!

Ana yurdun qız-gəlini! Yuyub qurudun
O qocanın əynindəki tərli köynəyi.
Şöhrətidir, vüqarıdır o, bizim yurdun,
Yazılmamış bir dünyadır onun ürəyi...

O dastanı oxuduqca mən varaq-varaq,
Deyirəm ki, o müqəddəs bir kainatdır.
Axtarsan da bu dünyanı sən çıraq-çıraq,
Qocaları hörmət görən bizim həyatdır!

Yeddi oğul atasıdır bizim Bəxtiyar,
Od parlayır hər birinin öz qılıncından.
Yeddi aslan ürəyinin bircə andı var:
"Azad torpaq... Azad bahar... Bəxtiyar insan!"

Bu and ilə xəbər verir bizə cəbhədən
Bizim zəfər toplarının o qadir səsi.
Kəsiləcək yer üzündən, inanıram mən,
Müsibətin, fəlakətin ilan nəfəsi!

Bahar! Bahar! Müqəddəsdir o saf camalın,
Sənin gözəl fitrətində yoxdur yamanlıq.
Bir möhtəşəm aynasısan hüsnün, kamalın,
Bu kamala yetişsəydi ömrüm bir anlıq.

Vətən yurdu, doğma ocaq! Bəxtiyar insan!
Sənin qartal qanadınla mən uçacağam.
Həyat üçün doğulmuşam yaranışımdan,
Şeir, sənət aləminə nur saçacağam!

Günəş doğdu, səhər güldü, sinəm boşaldı,
İlham aldım ana yurdun söz qüdrətindən.
Şair könlüm rübabını eşq ilə çaldı,
Bir əbədi qardaş olduq: ilk bahar və mən!

*1944, 13 aprel*

## DƏRMAN VERİN!

Mənə dərman, dərman verin, qəlbim yanmasın,
Günəş təbim şölə çəkib alovlanmasın...

Üzüqoylu torpaqlarda sürünüm ki, mən,
Tərlan könlüm ağ buluda havalanmasın.

Yaşamağın, yaratmağın min bəlası var...
Bu dərdimə inanmayan qoy inanmasın.

Məni candan usandıran arsız paxıllar.
Rəzalətlə yaşamaqdan heç usanmasın.

Qucaq-qucaq oğurlasın sözümü "dostlar",
Barı sənət qüdrətimi onlar danmasın.

Mən deyirəm yurdumuza dastanlar qoşaq,
Rəvadırmı qələmdaşlar məni qanmasın?

Bu şerim də bir atəşdir! Qoy bunu ellər
Bir acizlik, bir şikayət kimi sanmasın!

*1944, 16 aprel*

## GƏLMƏSƏNİZ DƏ...

Gəlin dostlar, məclis quraq mənim bağımda,
Araq deyil, şərab deyil, sadə çay içək.
Açılmamış bir kitab var can otağımda,
Varaqlayaq, bir çoxunun üstündən keçək...

Yox! Oxuyaq bu kitabı qoy varaq-varaq,
Mən sənətkar olmamışam sir saxlamaqda...
Ürəkdəki bağlı bir söz kimə qalacaq?
Bilirsiniz fitrətimi mənim bu haqda.

Gəlin dostlar! Mənim könlüm dönməmiş sizdən,
Bağımdakı tut ağacı bir alaçıqdır.
Məhəbbətlə tutacağam əllərinizdən,
Qəlbim kimi üzünüzə qapım açıqdır!

*1944, 10 iyul*

## SÖZÜN ŞÖHRƏTİ

Qanadlan hüsni-eşq ilə! Məkanın asimanlardır;
Gül üzlü bir səhərsən ki qucağında bahar vardır.
Sənin hüsnün də, eşqin də yaranmışdır həqiqətdən,
Ürək doymaz, xəyal küsməz müqəddəs bir təriqətdən.
Rübabın incə tellərdir... Min aləm var təranəndə,
Adın "Sözdür", özün insan! Nə mənalar yaşar səndə?!
Şüurlar dərs alar hər an sənin yetkin kamalından...
Şəfəqlər, şölələr parlar həyata gün camalından...
Nə məna varsa, bil, sözdə, könül doymaz bu mənadan,
Bəşərdir şöhrətin yalnız, əməllərdən yarandın sən!
Sənin fəxrin də, şənin də zamanla, əllə ölçülməz,
Xeyir söz! Şad xəbər! Sənsiz könüllər şad olub gülməz!

Bütün məclislərin fəxri, duyan hər qəlbi zinətsən!
Əməllər, arzular oğlu! Bütün dünyanı seyr et sən.
Könüllər mülkü yurdundur... Sənin min həmdəmin vardır,
Sənin səyyar qanadlarla uçan bir aləmin vardır!
Sözün mənası hədd bilməz! Uçub yüksəl bu qüdrətlə,
Kamalın incilər saçsın, danış hər yerdə hikmətlə.
Sözün eşqilə, qəlbilə yaşar aləmdə dastanlar,
Sözün səyyar xəyalilə gəzər dünyanı insanlar.
Sözün qəlbində gizlənmiş bütün dahilərin eşqi,
Sözün qəlbində sakindir göyün eşqi, yerin eşqi.
Sözün şənində şöhrət var, bu məna qəflətən solmaz,
Çiçəksiz, sözsüz, insansız, səadətsiz bahar olmaz!
Şeir, sənət əzəl gündən sözün hüsnilə yoğrulmuş,
Zamanın sirri, sevdası, onun qəlbində nəqş olmuş.
Sən ey "Söz" adlanan nemət! Tükənməz bir xəzinən var,
Başından min boran keçmiş, dəyişmiş qanlı dövranlar.
Fəqət sənsiz nə bir gülşən, nə bir yarpaq göyərmişdir,
Nə eşqin laləzarından bir insan lalə dərmişdir.
Gözəllər, türfə cananlar dodağında gül açdın sən,
Könüllər məst olub getdi sənin sevdalı ətrindən.
Şirin söhbətlə, ülfətlə dalar sevdayə həmdəmlər,
Mehriban, isti bir sözlə uçar dərdlər, keçər qəmlər...

Boyaqsız, rəngsiz, əmmasız olan söz daima haqdır,
Sözün keçməzsə bir yerdə böyüklük sadə susmaqdır.
Qananlar məclisindən keç ki, feyz al sözlə söhbətdən,
Fəqət qanmazlar ağzında düşər Loğman da qiymətdən.
Nahaq söz od vurar qəlbə, fəqət haqq söz keçər daşdan,
Ucuz söz qan qaraldar ki, küsərsən dostla sirdaşdan.
Fəlakətlər doğurmuşdur riyalar, bir də böhtanlar,
Yalan sözdən həyat ummuş həyasız, qansız insanlar.
Gözəl söz! Qəhrəmanlıqla keçən bir şöhrətin varmış,
Adın dahilər ağzında hücumsuz cəbhələr yarmış...
Sənin ulduzlu alnında müzəffər, şanlı bir ordu –
Bütün aləm qoşun çəksə, alınmazdır sözün yurdu!
Qılıncdan, nizədən kəskin, zamandan, oxdan ötgünsən,
Bu gün hər nəşəyə bir dost, sabah hər dərdə yetkinsən.
Bütün qanunların hökmü yazılmış sözdə bir xətlə:
“Ədalət! İxtiyarın var can alsan haqqa hörmətlə!
Həqiqət! İncədir qəlbin, fəqət dönməz iradən var!
Kamal! Sən bir günəşsən ki, camalından şəfəq parlar!
Məhəbbət! Ömrü sevdasız yaşatmaq bir cinayətdir!
Gözəllik! Canlı bir sənət, əzəldən ömrə zinətdir!
Səadət! Sirlər yurdu, müqəddəs bir pərisən sən!
Vətən! Namus da, vicdan da yaranmış şanlı hüsnündən!
Vətən qoynunda bəslənmiş əməllər, arzular, şəksiz,
Vətənsiz, yurdsuz insanlar yaşar aləmdə məsləksiz!”
Bu sözlərdir mənim eşqim, bu mənalar baharımdır,
Bu qüdsiyyət, bu şeriyyət mənim bir laləzarımdır.
Bütün aləm çiçək dərsin, ətir çəksin bu gülşəndən,
Zamanın, varlığın, hüsnün rübabından yarandım mən!
Yaz ey Vurğun ki, hər şerin, sözün bir yadigar olsun!
Mən ölsəm də, vətən eşqim vətən mülkündə var olsun!

*1944*

## ZƏFƏR TƏRANƏSİ

Alay-alay, qoşun-qoşun yürüdükcə mənim ordum,
Zülmətləri şimşək kimi yarıb keçdi, ana yurdum.
Neçə ulduz yanıb söndü, keçdi tufan, doğdu səhər,
Bahar donlu, şaxta üzlü bir yol keçdi bizimkilər.
Üfüqlərə şölə saldı, baxtımızın dan ülkəri,
Bu dağlara salam verdi, al günəşin şəfəqləri.
Boranların, zülmətlərin yaman üzü bərk olarmış,
Lakin insan qüdrətinin ilahi bir eşqi varmış.
Yaralanmış ana torpaq öz bağrına basdı bizi,
Sinəsinə qanla yazdı, bizim həyat eşqimizi.
Baxıb Vətən dünyasının min pərişan gülzarına,
Biz and içdik səhər-axşam şəhidlərin məzarına.
Biz and içdik anaların, balaların fəryadına,
"Süngümüzlə heykəl quraq, hər igidin öz adına".
Gəlib keçdi başımızdan, ağır aylar, ağır illər,
Alovların qucağında nəfəs aldı bizim ellər.
Ağır toplar dilə gəldi ana yurdun haqq səsindən,
Zaman görmüş, dünya görmüş bir torpağın nəfəsindən.
Od parladı qara üzlü, ilan başlı zülmət üstə,
Bəxtiyarlıq qılınc çəkdi ölüm üstə, möhnət üstə.
Bu günlərin yazılmamış dastanını varaq-varaq,
Qərinələr bizdən sonra şeir kimi oxuyacaq.
Gözün aydın, haqq ordusu, gözün aydın, qızıl əsgər!
Min bir zəfər müjdəsidir addımından qopan səslər.
Sənin şahin gözlərində insanlığın vüqarı var,
Taleyinə yazılmışdır bir səadət, bir də bahar.
Sənin şanlı bayrağının ilk andıdır xilaskarlıq,
Qoy isinsin nəfəsindən boran görmüş bütün varlıq.
Yollarına çiçək səpir, macar oğlu, yunan qızı,
"Gəl, ölümün pəncəsindən qurtar, – deyir, – haqqımızı".
Sən süngünü sancan zaman Əhrimənin ürəyinə,
Qoca Hürmüz qovuşacaq öz müqəddəs diləyinə.
O vaxt ölüm kabusu da öz qanına bulanacaq,
Həyat eşqi günəş kimi asimanlar dolanacaq.

O vaxt əsər qalmayacaq bir fəlakət, bir də şərdən,
Səadətsə bahar kimi don geyəcək şəfəqlərdən.
Uğur olsun, Qızıl Ordum, bu azadlıq səfərinə,
Salam yetir mən dediyim o qurtuluş səhərinə.
Alqış sənin qəlbindəki o müqəddəs məhəbbətə!
Alqış sənin qolundakı, süngündəki o qüdrətə!
Bu günlərin yazılmamış dastanını varaq-varaq,
Qərinələr şeir kimi bizdən sonra oxuyacaq.

*1944, 3 noyabr*

## İSTİQBAL TƏRANƏSİ

Günəşlər, aylar, ulduzlar vüqar ilə dolaşdıqca,
Müzəffər ordumuz hər gün dənizlər, dağlar aşdıqca,
Yerin qəlbində tufanlar, təlatümlər qopub çağlar,
Səadət al geyindikcə, fəlakət yas tutub ağlar...
Müqəddəs intiqam eşqi qılınc çəkmiş üfüqlərdən,
Xəyalım tək uçur göydə şəfəqli, nurlu bir yelkən...
O, şimşəkdən qanad taxmış süzür göylərdə sürətlə,
O insandır, o insandır, ucalmış ərşə qüdrətlə.
O, insandır ki hər haqqı, nəsibi qəhrəmanlıqdır,
Hünərsiz millətin yurdu günəşsiz bir qaranlıqdır!

Hünərdir ömrə ilk zinət, onun hüsnündə məna var,
Qılınclar, nizələr haqdan, hünərdən şövq alıb parlar!
Hünər insanla bir yerdə, bir anda qandan olmuşdur;
O ən parlaq əməllərdən, ümidlərdən doğulmuşdur.
Hünərsiz bir nəfəs sönmüş, kül olmuş aşiyandır, bil!
Hünərsiz günlər ulduztək batar bir-bir, sönər bir-bir.
Hünərlə hər zaman, hər an həqiqət nuru yanmışdır,
Bütün zəncirlərin hökmü hünərlə parçalanmışdır!
Hünər dünyası azaddır – fəzalardan aşır qartal.
Fələklər hökm edir guya: o ülviyyətdən ilham al!
Atıl ümmana eşq ilə, qanad çal, dalğalardan keç,
Öz eşqin, haqqın uğrunda səadətdən, bahardan keç!
Səfasız bir xəyalatdır hünərsiz bir həqiqət də,
Hünərsizlik itaətsə, rəzalətdir itaət də!..
Zamanın şanlı övladı qılınc taxmış bu imanla,
Axar çaylar, yaşıl düzlər boyanmışdır qızıl qanla.
Dumanlar, tüstülər qopmuş tüfənglər, toplar ağzından;
Həyat eşqilə odlardan, alovlardan keçir insan!
Mənim yurdum da səf çəkmiş, qoşun tökmüş vüqar ilə,
Bu Odlar Yurdu sirdaşdır əzəldən ilk bahar ilə.
Alaylar cərgələnmişdir, uçur təyyarələr, tanklar;
Əsir çovğun, qopur tufan, yerin qəlbində yanğın var!
Zamanın qəlbi darğındır, ömürdəndir keçən hər an,

Yanır gözlərdə min şimşək çatılmış qaşlar altından!
Uçub səyyar xəyalımla uzaqlaşdım bu aləmdən,
Zamanlar adlayıb keçdim, bir istiqbala vardım mən.
Bir istiqbal ki, qoynunda gül açmışdır bütün aləm,
Onun ulduzlu hüsnündə,
Müzəffər, şanlı köksündə
Nə bir qəm var, nə bir matəm!
Şəhidlər qəbri üstündə o istiqbal qurulmuşdur,
Bulanlıq çaylar, ümmanlar, tamam yer, göy durulmuşdur.
Könüllər mülkü ney tutmuş, xuramandır bütün dünya...
Əməl, arzu, xəyal, sevda
Ötür bir sazda, bir simdə, bir ahəng, bir səadətlə,
Ötür hər qəlbə, vicdana, hər eşqə, hüsnə hörmətlə.
Gülür torpaq, gülür insan,
O çıxmış yas libasından.
Səma şəffaf,
Çiçəklər saf,
Yerin qəlbində toy-bayram!
Gülür sənət,
Gülür ilham!
Günəş tək nurə qərq olmuş bütün xilqət!
Çırağbandır tamam yer, göy; nə zəncir var, nə bir zindan,
Bütün insanlıq al geymiş, keçir ömrün baharından.
Qılınclar, nizələr, oxlar, ağır toplar pas atmışdır,
Kamalın hüsni-eşqilə bəşər cənnət yaratmışdır.
Xəyal səyyar pərilərtək süzür göylərdə ülfətlə,
Çiçəklər, quşlar, insanlar dil açmış bir məhəbbətlə.
Qovuşmuş ayrı ümmanlar... Nə qürbət var, nə həsrət var,
Bir eşqin şanlı hüsnilə gəlir dünyaya insanlar...
Kamal hakim... Söz azaddır...
Xəyal səyyar... Ürək şaddır...
Bütün dünya
Deyir guya:
Bu qardaşlıq şüarımdır!
Təbiətdə,
Həqiqətdə

Nə məna varsa əvvəldən...
O sevdadan yarandım mən –
Gözəllik ilk baharımdır!
Xəyaldır bəlkə bunlar ah!.. Qoy olsun, daş deyil insan.
Xəyal idrakla bir yerdə gəlib keçmiş zamanlardan...
Xəyalsız fikrin övladı səfildir, daima acdır,
Həqiqət bir günəşdirsə, xəyalla eşqə möhtacdır!
Qanadsız bir böcək uçmaz, sürünmək qurda adətdir.
Kamal səyyar doğulmuşdur, xəyal sevdası nemətdir...
Xəyalın hüsnü heç solmaz... Bu sənət daima vardır –
Zamanı fəth edən ərlər yenilməz qəhrəmanlardır...
Alovlardan yol açdıqca sən öz nizənlə, süngünlə,
Yaşar fikrin, gülər eşqin sabahkı şanlı bir günlə.
Çıraqbandır tamam yer, göy; nə zəncir var, nə bir zindan,
Bütün insanlıq al geymiş, keçir ömrün baharından...
Səma şəffaf,
Çiçəklər saf.
Yerin qəlbində toy-bayram,
Gülür sənət,
Gülür ilham!
Günəştək nurə qərq olmuş bütün xilqət!

*1944, 5 oktyabr*

## ŞAİR, NƏ TEZ QOCALDIN SƏN?!.

Bülbül olub düşdüm bağa,
Nalə çəkdim sola, sağa.
Səsim düşdü min budağa,
Susdu çəmən... dindi gülşən: –
Şair, nə tez qocaldın sən?!

Könül verdim min axşama,
Pərvanə tək yandım şama...
Gözündən yaş dama-dama
Şam da dilə gəldi birdən: –
Şair, nə tez qocaldın sən?!

Məclislərə düşdü yolum,
Gənclik oldu sağım, solum.
Dedim yatıb rahat olum...
Sual qopdu hər ürəkdən: –
Şair, nə tez qocaldın sən?!

Tüfəng alıb çıxdım ova,
Doğdu günəş, güldü hava,
Ceyranları qova-qova,
Cavab gəldi güllələrdən, –
Şair, nə tez qocaldın sən?!

Kəndə getdim... Bir ağbirçək
Qucaqladı məni görcək.
O ağladı bir ana tək...
Dedi: – Kaş ki, öləydim mən,
Şair, nə tez qocaldın sən?!

Qəribədir: üzü arsız,
Şaxta qəlbi ilk baharsız...
Eşqi, sözü etibarsız
“Dostlarım” da deyir bəzən: –
Şair, nə tez qocaldın sən?!

Viran könlüm varaq-varaq...
Əsdi xəzan, düşdü yarpaq.
Ana vətən, ana torpaq
Bir ah çəkdi sinəsindən: –
Şair, nə tez qocaldın sən?!

Polad sinəm, döz bu dərdə,
Günəş batmaz ilk səhərdə...
İnsan donlu iblislər də
Baxıb mənə deyir qəsdən: –
Şair, nə tez qocaldın sən?!

Qartal olub qanad açdım,
Zamanları keçib aşdım,
İnsanlardan uzaqlaşdım,
Səda gəldi yerlə göydən: –
Şair, nə tez qocaldın sən?!

*1944,10 noyabr*

## TƏZƏ İL SOVQATI

Bu gün daha bəxtiyardır sinəmdə ürək,
O, “yaz!” deyir, “yarat!” deyir mənə müttəsil.
Başdan-başa silahlanmış bir qəhrəman tək,
Yurdumuza ayaq basır qırx beşinci il...
Bu təzə il şərəfinə məclis qurulur,
Yenə sənət piyaləmi doldururam mən...
Gecə keçir... Günəş doğur... Zülmət durulur...
İlk baharın müjdələri keçir qəlbimdən.
Ayrılıram bir anlığa düşüncələrdən,
Unuduram bu məclisi, bu səadəti.
Çünki gəlir gözlərimin önünə birdən
Bir dostumun səhər üzlü insan surəti.
Gözəl dostum! Mən evdəyəm, sənsə uzaqda...
Bəlkə bu dəm şinelinə səpələnir qar.
Mənim təbim dil açdıqca isti otaqda,
Səni bir dağ ətəyində döyür boranlar...
Yox! Bəlkə də bir torpaqlı daxmacıqda sən
Bir kitabça varaqlayıb məni anırsan?
De, bəlkə də ürək yanır öz nəfəsindən,
Sevgilini yada salıb alovlanırsan?
Uzaqdasan... Görməyirəm... Bəlkə də bu an
Qar üstündə sürünürsən bizdən aralı.
Sən uğursuz bir güllənin ağrılarından
Zarıyırsan pələng kimi, sinən yaralı.
De, bəlkə də od içində bu gecə yarı,
Söndürürsən yandırılmış bir xanimanı.
Ya da, dostum, o yanğının tünd alovları
İşıqladır qara geymiş bir asimanı.
De, bəlkə də qabağında bir dəstə yağı
Boyun büküb əsir gəlir... Sənsə vüqarla
Anıb yenə ana yurdu, ana torpağı,
Yerə-göyə sığmayırsan min iftixarla!..

***

Uzaqdasan... Görməyirəm surətini ah!..
Qış vaxtıdır... Gödəlmişdir hicran günləri...
Budur... budur, pəncərədən boylanır sabah...
Surətinə yazılmışdır insan hünəri.
Bu təzə il məclisinə göz açır səhər,
Al günəşin ilk şəfəqi yayılır dağa.
Bu vaxt sənin sağlığına dinir qədəhlər,
Bütün məclis ehtiramla qalxır ayağa...
Mənsə şerə nəqş edirəm bu diləyimi:
Ötərgidir şərablardan qopan ehtiras...
Sənsə məni qardaş kimi öz bağrına bas!
Sənə sovqat göndərirəm öz ürəyimi.

*1944, 28 dekabr*

## QƏHRƏMANIN ÖLÜMÜ

Bütün Bakı fikirdədir, göy sükutda, dəniz lal...
Nə meh əsir, nə titrəyir ağacların yarpağı.
Hər ürəkdə bir döyüntü, hər baxışda bir sual...
Bu gün çatmış qaşlarını Azərbaycan torpağı.

Vətən oğlu! – Bu iki söz dodaqlarda yandıqca,
Hər ürəyin telləri də qəmli-qəmli saz tutur.
Vətən mülkü öz oğlunu ana kimi andıqca
Ağır dağlar fikrə gedib, öz qəlbində yas tutur.

Cəbhədəsə, bizdən uzaq, Həzi! – deyən hər əsgər
O tabutun qarşısında diz çökərək and içir.
Tanklar uçur, ordu keçir, darılmışdır üfüqlər,
İntiqamın yanan qəlbi şaxta udur, qar içir.

İllər keçir... Yaşa dolur süd ağızlı körpələr,
Nəsil-nəsil ürəklərdə yuva salır qəhrəman.
Şəfəq saçır türbəsinə min səadət, min səhər,
Bu əməllə, bu eşq ilə o keçdi öz canından.

Rəssam alıb fırçasını xəyallara qərq olur,
Bahar kimi şəfəqlənir qəhrəmanın surəti.
Könüllərdə söhbət olub neçə məclis qurulur,
Alqış deyir mərd oğula şerin, sözün qüdrəti.

Qərinələr arxasından Cavanşir də, Babək də
Qılınc ilə salam verir bu müqəddəs türbəyə.
Göydə günəş şölə saçır, nəğmə tutur külək də
Yerdə insan nəfəs alır, qəhrəmana eşq! – deyə.

*1945, 2 fevral*

## AH, PAXILLAR!

Biri gedir, biri gəlir paxılların bu dünyada,
Bir iblisdir ilan başlı, balıq qanlı bu insanlar.
Bir şairin yalnız ömrü tor içində gedir bada...
Nə yazıq ki, bu sirrimi nə anlayan, nə duyan var.

Haqqım varmı dövranımdan, vətənimdən inciməyə?
"Xeyr! Xeyr!" – bu səs gəlir gecə-gündüz ürəyimdən.
Mən öz kasıb sənətimi başlamışam "ellər" – deyə
Bu ilhamla, bu imanla öləcəyəm cahanda mən.

Fəqət, durur gözlərimin qarşısında bu iblislər,
Ürəyimdə külək əsir, yarpaq düşür, çiçək solur...
Gecəm keçir xəyal ilə, sual verir mənə səhər!
– Hansı şair, hansı qələm öz vaxtında xoşbəxt olur?..

*1945, 24 fevral*

## DƏLİLƏR EVİ

Loğman fikirlərə qərq olduğu vaxt,
Rəngi gah saralıb, gah da solardı...
Cahanda sirdaşsız qalmış o bədbəxt
Hicra bir aləmə həmdəm olardı...

Salam verərdilər ona da hərdən...
Lakin eşitməzdi onları loğman –
İnsan xəyalata qərq olan zaman
Bütün kainatı unudur bəzən.

Loğman ayrılmadı öz əməlindən
Bu dərdlər qırmadı iradəsini.
Yenə də qəlbində, dilində Vətən
Eşitdik susmayan həyat səsini.

Ürəkdən ah çəkdi, qananlar onu
Dedilər: “yəqin ki, bir amalı var”...
Onun bulud kimi tutulduğunu,
Soyuq bir nəzərlə görən nadanlar:

– Yox, canım, pozulmuş başı, fikirdən,
Yəqin ki, dəlidir... Çoxdan xəstədir!...
Təbib deyilik ki, nə sən, nə də mən
Biz ona yansaq da mənası nədir?

Şəhərə səs düşdü: “Dəlidir loğman!”
Axır apardılar dəlixanaya.
Osa ürəyindən qan axan zaman
Dərdini söylədi ulduza, aya!

Yığışdı təbiblər, yoxladı onu.
Loğman öz-özünə gülürdü hərdən.
Seyr edib kamalın nə olduğunu
Dəlilər gülürdü pəncərələrdən...

Az keçdi, üz keçdi verildi qərar:
“Dəlilər evində Loğman sağaldı”.
Təəccüb eylədi bütün insanlar,
Loğmanın özü də heyrətdə qaldı...

Köhnə dostlarından dedi bir nəfər:
– Loğman, gözün aydın, yenə sağaldın!
Necə qarşıladı səni dəlilər?
Bu təzə ağlını, de kimdən aldın?

Loğman cavab verdi: – Bütün dəlilər
Orda ayrılmışdır hər məhəbbətdən...
Orda nə dostluqdan qalmış bir əsər,
Nə də bir nişan var mehri-ülfətdən.

Eşqi bir, sözü bir, dili bir olan
İkicə nəfər də görə bilməzsən!
Nə qədər xudpəsənd yaranmış insan,
Bu dərdlə orda da qəmlər yedim mən!

Bəli! Yer üzünə gələn hər insan
Min könül sındırıb, ürək qanadır...
Görünür varlığın yaranışından
Dünya da bir cürə dəlixanadır!

*1945*

## İYİRMİ BEŞ BAHAR

Bu gün könlüm evi yenə abaddır
Şanlı, təntənəli bir şəhər kimi.
İlham pərisi də qəmdən azaddır,
Gülür taleyimə bir səhər kimi...
Keçir alay-alay gözümdən bu an
Göyün də, yerin də qəhrəmanları.
Nur yağır insanın baxışlarından,
Xəyalım fəth edir asimanları.
Bir budaq üstündə bir yaşıl yarpaq,
Bir dağ döşündəki at kişnəməsi,
Bir kənd evindəcə yanan bir çıraq,
Bir aşiq qəlbinin saz şikəstəsi.
Bir Vətən eşqilə cahanda şaddır,
Mənim könlüm kimi qəmdən azaddır.

Bir su kənarında sadə çiçəklik,
Günəşli, gündüzlü azad bir səhər,
Muğan düzündəki xınalı kəklik,
Baharın müjdəsi o bənövşələr,
Hələ dağ başında gördüyüm qar da,
Uçan böcəklər də, qarışqalar da
Bir Vətən eşqilə cahanda şaddır,
Mənim könlüm kimi qəmdən azaddır.
O sevda yolçusu, mehriban ceyran,
O ağ buludlarla döyüşən dağlar,
İnsanın eşqinə, hüsnünə heyran
Günəşin elçisi bu nazlı bahar,
Füzuli şerinin sirdaşı bülbül,
Gülləri sayrışan hər bağça, hər bağ,
Bizim gəlin kimi həyalı sünbül,
Gözəllik anası o qara torpaq,
Yerin sinəsindən cığırlar salmış
Zamanın, dövranın karvan yolları.
Ölümdən zülmətdən intiqam almış

Zərdüşt torpağının mərd oğulları.
Dağların başından vüqarla baxan
Dəlik-deşik olmuş əski qayalar.
Dumanlı zirvəsi göylərə qalxan
Şair vüqarı tək enməz qayalar.
Bir Vətən eşqilə cahanda şaddır,
Mənim könlüm kimi qəmdən azaddır.

Al geymiş Bakı da – bizim paytaxt da
Hər ulduz parlayır bir çəmən kimi.
Mən bu səadətlə güldüyüm vaxtda
Şadsan, ey oxucum, sən də mən kimi!
Sənin də əynində bayram paltarı,
Vüqarla baxırsan yer ilə göyə...
Bu Vətən mülkünü – bu laləzarı
Bağrına basırsan öz anam deyə.
Ah, vətən torpağı, insan nəfəsi!
Ömründə bu qədər sevməmişəm mən,
Hələ dil açmamış bir çocuq səsi
Mənə xəbər verir qərinələrdən!..

*1945*

## ZƏFƏR BAYRAMI

Qoy çalıb-oynasın Vətən torpağı,
Göylər səcdə qılsın bu ülviyyətə.
Ölümün, zülmətin qara bayrağı
Bu gün təslim oldu bizim qüdrətə!

Yazılsın tarixə bir qızıl xətlə
45-ci ilin doqquz may günü.
Başlansın şeirlə, sazla, söhbətlə
Bu ellər bayramı, ellər düyünü.

Mən də haqq eşqinə, insan eşqinə
Günəşi qaldırdım piyalə kimi.
Şəhidlər ömrünün saf türbəsinə
Şerim ətir saçır bir lalə kimi...

Ey qoca kainat! Hər kamını al!
Al geyin, sevgilim! Fəsli-bahardır,
Gəlsin məclisimə bu gün istiqbal
Görsün ki, qəlbimdə nə büsat vardır!..

Ey ilham pərisi! Ey azad səhər!
Nə qədər bəxtiyar görürəm sizi!
Ey bu gün cahana gələn körpələr,
Günəş salamlayır taleyinizi!

Sən ey, mərd oğula süd verən ana!
Qoy öpsün əlini illər həsrəti.
Xeyir-dua versin Azərbaycana
O ana qəlbinin saf məhəbbəti!

Gül, ey nazlı Vətən! – Odlar torpağı!
Düz-çörək hazırla qəhrəmanlara.
Böyük bir ordunun zəfər bayrağı
Günəş tək yayılır asimanlara.

*1945, 9 may*

## BÖYÜK BƏSTƏKAR

Qartal kimi qanadlanıb fəzaları aşarsan,
Bir ülviyyət aləminin qucağında yaşarsan.

O aləmin zinətidir ayın, günün camalı,
Rübabında qanad açır insanlığın kamalı!

Zaman görmüş, dünya görmüş müqəddəs bir Vətənin
Övladısan! Şərəfindir, şöhrətindir bu sənin.

Ah, dil açıb danışdıqca yaratdığın nəğmələr,
Günəş kimi bayraq çəkir xəyalına min səhər...

Min səhər ki, onun hüsnü şeir qədər gözəldir,
Yaratdığın o gülşənlər, o çəmənlər gözəldir.

Gözəlliyin heykəlidir sənətində canlanan,
Vətən mülkü alqış deyir bu sənətə hər zaman.

Dil açdıqca rübabının o mənalı telləri,
Ürəyində min ney tutur Azərbaycan elləri...

Nəğmən gəzir çəmənləri gözəllərin dilində,
Sevdasına qanad verir bülbülün də, gülün də.

Nə zaman ki, ümman olub dalğalanır ürəyin,
Mən duyuram mənasını min müqəddəs diləyin.

Sən ki, həyat aşiqisən... Qoy bu eşqin var olsun,
Nəsillərdən-nəsillərə adın yadigar olsun!

Qartal kimi qanadlanıb fəzaları aşarsan,
Bir ülviyyət aləminin qucağında yaşarsan.

O aləmin zinətidir ayın, günün camalı,
Rübabında qanad açır insanlığın kamalı!

*1945*

## MƏNİM ARZUM

*Daddımsa aləmin hər nemətini,*
*Dilbər guşələrdə ötdüsə ömrüm, –*
*Dünyanın ən böyük səadətini*
*Bu boylu çinarın altında gördüm.*

***B.Adil***

Şair! Nə incədir rübabın sənin!
Uçurdu ruhumu çaldığın bu saz!
Vətən torpağında bitən gülşənin
Yarpağı saralıb, çiçəyi solmaz.

O səcdə qıldığın çinar kölgəsi
Mənim də şerimin qibləgahıdır.
Qurbanı olduğum Odlar ölkəsi
Hüsnün də, eşqin də ilk sabahıdır.

Sən ana torpağı qarış-qarış gəz,
Hər daşın altında bir gövhər axtar.
Eşqinə, qəlbinə yad ola bilməz
Vətən sevgisiylə yanan sənətkar.

Şair! Yuvasından tərlanı səslə,
Qartal qanadınla fəzaları aş!
Bu ilk məhəbbətlə, bu ilk həvəslə
Mən keçən yolları sən də keç, qardaş!

Vaxtdır! Bu eşq ilə bir dastan başla,
Min ürək dil açsın hər varağında.
Babalar yurdunu sən də alqışla,
Bizim Vaqif kimi Kür qırağında.

Hər otun, çiçəyin öz adını yaz,
Hər insan ömrünün bir kitabı var.
Mənasız gözəllik xatirdə qalmaz,
Sənə sarban olsun böyük arzular.

Danışdır torpağı, hər sirrini aç,
Oxuyub doymasın nəsillər onu.
Kamalın hüsnündə günəşə nur saç –
Onun nə ilki var, nə də ki, sonu.

Şeir rübabını sən ürəklə çal,
Ürəksiz deyilən sözlər saxtadır.
Sənə oğlum deyir bu gün istiqbal –
Elə zənn etmə ki, o uzaqdadır!

Gələcək eşqilə yanan bir ürək
Ağlın fəzasında balü pər açar...
İstiqbal idrakla şəfəqlənəcək,
Hər tilsimli yolu bir hünər açar...

Uç, uç! Sən xəyalın asimanında
Hər daşa, torpağa qanad ver, qanad!
Etila hüsnü var insan qanında –
Bizə yüksəl deyir anamız həyat!

*1945, 9 noyabr*

***

Bu gün qəzetdəki öz əksimdə mən
Gördüm gəncliyimin gülər üzünü.
Bir arzu dil açıb dedi qəlbimdən,
Ah, belə qalaydım ömrüm uzunu.

*1946, 20 fevral*

## MƏNİM RÜBABIM

Demə susdu rübabımın telləri,
Hər pərdədə bir nəvası var onun!
Xəbər verin, sevindirin elləri,
İndən belə yüz havası var onun!

Mənim şerim övlad oldu torpağa,
Həyat verdi hər saralmış yarpağa,
Nəfəsimdən dağlar qalxdı ayağa,
Bu yerlərdə min sədası var onun!

Tərlan təbim havalanıb uçsa da,
Şimşək olub, buludlardan keçsə də,
Fəzalardan sizə söhbət açsa da,
Vətən adlı öz yuvası var onun!

Sevdim qızıl bayrağını, ey səhər!
Xoşbəxt olur bu dünyada sevənlər.
"Həyat" dedi yaratdığım hər əsər,
Ellər bilir nə mənası var onun!..

Sinəmdədir Vətənimin haq səsi,
Sazımdadır azadlığın nəğməsi,
Səadətdir onun eşqi, həvəsi,
Ehtişamlı bir dünyası var onun!

Odlar yurdu, əhdimiz var əzəldən,
Bu ilqardan nə mən döndüm, nə də sən.
Ana qəlbin bir ümmandır, ey vətən!
Vurğun kimi bir qəvvası var onun!

*1946*

## UNUDULMUŞ TƏK MƏZAR

### I

Bu gün məni səyyar xəyal
Öz dünyamdan qoparmışdır...
Qulağı kar, dili də lal
Bir aləmə aparmışdır.

Nə şənlik var orda, nə səs,
Torpağı dərd, suyu qəmdir.
Onu heç kəs keçə bilməz,
O, tilsimli bir aləmdir...

Bilinməyir onun yaşı,
Köhnə adı qəbristandır.
Hər fikirli qəbir daşı
Elə bil ki, bir insandır –
Göz yumaraq yerə, göyə
Qərq olmuşdur düşüncəyə...

Nələr vardır orda, nələr;
Göy sərvlər, göy çinarlar.
Bir də mərmər abidələr
Dayanmışdır qatar-qatar.

Heykəllər də durur səf-səf,
Hava tutqun, zaman qışdır.
Qəbristanda dörd bir tərəf
Bahar kimi gül açmışdır.

Yazın seli, qışın qarı,
Əsən külək, yağan yağış
Daşlardakı yazıları
İllər boyu pozammamış.

Nələr deyir bu mənzərə!
Düşünürəm aram-aram:
Bizdən ayrı düşənlərə
Borcumuzdur bu ehtiram!

Hər türbədən bir qəhrəman
Sanki baxıb deyir bizə:
“Alovların arasından
Yollar açdım eşqinizə”.

Oğul doğan, qız böyüdən
Ağ birçəkli bir ananın –
O müqəddəs qəhrəmanın
Baş əyirəm önündə mən...

Dahilərin, şairlərin
Gözlərində dan sökülür...
Düşünürəm dərin-dərin,
Ürəyimə nur tökülür...

Elə bil ki, qanadı var
Qartal kimi, heykəllərin.
Gəlin, deyir, seyrə gəlin,
Öz qələmi, öz əliylə,
Öz işıqlı əməliylə
Min zülməti boğanın da,
Adi inək sağanın da
Öz ünvanı, öz adı var.

Nələr deyir bu mənzərə!
Düşünürəm aram-aram:
Bizdən ayrı düşənlərə
Borcumuzdur bu ehtiram!
Orda min bir qəbir saydım
Canlı kimi hava udur.
Mən cənnətə inansaydım,
Deyərdim ki, cənnət budur!

## II

Bu xəyalla gəzdikcə mən
Qəbristanı qarış-qarış,
Gözlərimə dəydi birdən
Üstünü ot, alaq almış
Bir məzar ki, nə baş daşı,
Nə ünvanı, nə adı var,
Nə həmdəmi, nə sirdaşı,
Nə doğması, nə yadı var.

Fikrə getdi qəlbim bir an...
Qəbristana keşik çəkən,
Gül basdırıb, ağac əkən
Dünya görmüş bir qocadan
Soruşdum ki: sən bilərsən,
Kiminkidir bu tək məzar?
Nə yazısı nə daşı var,
Nə üstünə gəlib gedən?

Qoca bir az gülümsədi,
Sonra qəbrə baxıb dedi:
– Qafil, özün bilməyirsən?
Səninkidir o tək məzar,
Onu dövran verdi bada;
Çox danışıb az yazanlar
Unudulur bu dünyada.

## III

Evə gəldim can pərişan,
Keçən ömrü soraqladım.
Bu fikirlə xeyli zaman
Kitabları varaqladım.

Ağıllı söz, yaxşı şeir,
Yazmışammı, varsa hanı?

Gördüm qoca doğru deyir,
Uçdu könlüm xanimanı...
Boğulduqca göz yaşıma
Dedim ömür yoldaşıma:
Qapıları tez ol bağla,
Otağı da bir az qızdır.
Sən də bil ki, təmtəraqla
Keçən günlər vəfasızdır!

Hanı qələm? Hanı kağız?
Tez ol gətir, a dildarım!
Barı gəzsin ağız-ağız
İndən belə yazdıqlarım...

*1946, 16 may*

## TƏBRİZİN ŞAİRLƏR MƏCLİSİNƏ

Əzizlərdən gələn məktub dil açdı mehrü-ülfətlə
Onun hər sətrinə mən də baş əydim hüsnü-hörmətlə.
Nələr gəldi, nələr keçdi mənim sevdalı qəlbimdən,
Bir ah çəkdim, ahım yandı sinəmdə daği-həsrətlə...
Uçub səyyar xəyalımla dolaşdım xaki-Təbrizi.
Hər üzdə bir boran gördüm, döyür əflakı hiddətlə.
Nədir şahin baxışlarda qopan tufan, çaxan şimşək
Alovlar, odlar övladı barışmaz yerdə zülmətlə...
Var olsun məslək eşqilə qılınca qurşanan ərlər
Vətən dünyası fəxr eylər bu gün bir şanlı millətlə.
Bir anlıq ömrə dəyməzmiş yüz illik nalənin ömrü,
Hünərdir varlığa zinət... günəş parlar cəsarətlə.
Görün nazəndə bir məclis öz eşqim, “Etimadımla”,
Mənim də, “Biriya”, qəlbim dil açdı bir məhəbbətlə.
Əzəldən loğman olmuşdur sual et: “Azərin oğlu”
Günəş Zərdüşt diyarından ucalmış ərşə “Fitrətlə”
Düşər bir gün yolum şəksiz, düşər Təbrizə qardaşlar,
Salamlar Vurğunun qəlbi sizi min sazla, söhbətlə.

[*1946*]

## YANDIRILAN KİTABLAR

*(İran irticaçıları Azərbaycan dilində olan kitabları vəhşicəsinə yandırırlar)*

Cəllad! Sənin qalaq-qalaq yandırdığın kitablar
Min kamalın şöhrətidir, min ürəyin arzusu...
Biz köçürük bu dünyadan, onlar qalır yadigar,
Hər vərəqə nəqş olunmuş neçə insan duyğusu;
Min kamalın şöhrətidir, min ürəyin arzusu...

Yandırdığın o kitablar alovlanır... Yaxşı bax!
O alovlar şölə çəkib şəfəq salır zülmətə...
Şairlərin nəcib ruhu məzarından qalxaraq,
Alqış deyir eşqi böyük, bir qəhrəman millətə;
O alovlar şölə çəkib şəfəq salır zülmətə...

Cəllad! Mənim dilimdədir bayatılar, qoşmalar,
De, onları heç duydumu sənin o daş ürəyin?
Hər gəraylı pərdəsində min ananın qəlbi var...
Hər şikəstəm övladıdır bir müqəddəs diləyin;
De, onları heç duydumu sənin o daş ürəyin?

Söylə, sənmi xor baxırsan mənim şeir dilimə?
Qoca Şərqin şöhrətidir Füzulinin qəzəli!
Sənmi "türkəxər" deyirsən ulusuma, elimə?
Dahilərə süd vermişdir Azərbaycan gözəli...
Qoca Şərqin şöhrətidir Füzulinin qəzəli!

Cəllad! Yanıb od olsa da, külə dönməz arzular,
Təbiətin ana qəlbi qul doğmamış insanı!
Hər ürəyin öz dünyası bir səadət arzular,
Qanlar ilə yazılmışdır hər azadlıq dastanı...
Təbiətin ana qəlbi qul doğmamış insanı!

Əzəl başdan düşmənimdir üzü murdar qaranlıq...
Hər torpağın öz eşqi var, hər millətin öz adı.

Kainata dəyişmərəm şöhrətimi bir anlıq,
Mənəm Odlar ölkəsinin günəş donlu övladı!
Hər torpağın öz eşqi var, hər millətin öz adı!

Nədir o dar ağacları, de, kimlərdir asılan?
Oyuncaqmı gəlir sənə vətənimin haqq səsi?
Dayan!.. Dayan! Oyaq gəzir hər ürəkdə bir aslan,
Boğazından yapışacaq onun qadir pəncərəsi.
Oyuncaqmı gəlir sənə vətənimin haqq səsi?

Cəllad! Sənmi de, qırırsan fədailər nəslini?
Millətimin saf qanıdır qurd kimi içdiyin qan!
Zaman gəlir... Mən duyuram onun ayaq səsini,
Şəhidlərin qiyam ruhu yapışacaq yaxandan;
Millətimin saf qanıdır qurd kimi içdiyin qan!

Bir varaqla tarixləri, utan mənim qarşımda,
Anam Tomris kəsmədimi Keyxosrovun başını?
Koroğlunun, Səttarxanın çələngi var başımda.
Nəsillərim qoymayacaq daş üstündə daşını;
Anam Tomris kəsmədimi Keyxosrovun başını?

Sür atını, dördnala çap! Meydan sənindir... ancaq,
Mən görürəm al geyinib gələn bahar fəslini...
Qoca Şərqin günəşidir yarandığım bu torpaq,
Mən yetirdim al bayraqlı inqilablar nəslini.
Mən görürəm al geyinib gələn bahar fəslini!

*1947, 20 yanvar*

## YER HƏSRƏTİ

Dan yerinin dumanından sıyrıldıqca göy hava,
Təyyarəmiz qartal kimi göyə qalxdı vüqarla.
Bizi, xeyir-dua verib yola saldı Moskva,
Arxamızca böyük şəhər baxdı min iftixarla.

(Qoca qartal dağ başında qərar tutub hər səhər,
Uçurduğu çolpaları bu qaydayla seyr edər).

Biz uçuruq qərbə tərəf... Göydəki sıx dumanlar
Axıb gedir dənizdəki parça-parça buz kimi.
Yer üstündə sıx şəhərlər, qəsəbələr, kəndlər var,
Göy meşələr cərgələnmiş zəfər ordumuz kimi.

Biz uçuruq yad ellərə... Ürək Vətəndə qalır...
Deyirlər ki, tamam bir ay çəkəcəkdir bu səfər...
Dəqiqədən-dəqiqəyə həsrətimiz çoxalır,
Eh, bəlkə də, bir həsrətin övladıdır hər əsər!

Təyyarənin qanadına yazılmışdır SSSR,
Bu dördcə hərf sinəmdəki nişanda da var mənim.
Ürək deyir: "Salamat qal, ana torpaq, ana yer!
Min il sənsiz yaşasam da, yenə sənsən Vətənim!"

Duyuram ki, ayaqlarım yerdən, göydən üzülmüş,
Zaman-zaman ürəyimdən soyuq keçir bir anlıq.
Elə bil ki, dövrəmizə neçə kabus düzülmüş,
Baxışlara kölgə düşür, təyyarəyə qaranlıq.

Propellerin gurultusu qulağımda əl çalır,
Ucalırıq... Ucaldıqca ucalırıq yenə biz...
Yermi göyə qovuşur de, göymü yerə alçalır?
Günəşimi fəthə gedir günəş dostu nəslimiz?

Dörd saatdır təyyarəmiz divan tutur göylərə,
Qanadların hiddətindən parçalanır buludlar.

Fəqət, göydə nə həyat var, nə yerdəki mənzərə,
Gözlərimiz yorulduqca mürgü vurur, a dostlar!

Yer həsrəti böyük dərddir, bunu göydə duyuram,
Duyuram ki, yer eşqidir hər insanın qüdrəti.
Öz müsafir dostlarıma arabir göz qoyuram,
Bənizləri dümağ olmuş... ağırdır yer həsrəti...

*1947, mart*

## TƏYYARƏ MEYDANI

Aha, yerə enirik ki, yetişdik yarı yola,
Ayağımız altındadır indi böyük bir şəhər...
Müsafirlər ləngər vurur gah sağa, gah da sola,
Bir-birinə baxa-baxa gülümsəyir nəzərlər.

Təyyarəmiz yavaş-yavaş enib düşür meydana,
Körük kimi sönüb gedir propellerin gur səsi.
Qara torpaq bir anadır insanlara, bir ana!
Bu dünyanın hər yerində xoşdur onun nəfəsi.

Kimdir bizi qarşılayan burda hərbi salamla,
Kimlər ola zər paqonlu generallar, zabitlər?
Gör necə də düzülmüşdür onlar bir ehtişamla,
Hər alında bir vüqar var, hər baxışda bir zəfər.

Tez əl verib görüşürük öz insanlarımızla,
İgidlərin duruşuna baxdıqca fəxr edirik.
Odlar keçib zülmət yaran qəhrəmanlarımızla,
Deyə-gülə, nahar vaxtı biz Berlinə gedirik.

*1947, mart*

## BERLİN

İlk dəfə gəzirəm mən bu şəhəri,
Nə cəlal görürəm, nə də təmtəraq...
Basıb daş yığını dar döngələri,
Ağırlıq altında təngiyir torpaq.

Nə kefdən əsər var, nə təntənədən,
Maşın da, insan da hələ seyrəkdir.
O məğlub çıxmışdır müharibədən,
Gülər üz, şad ürək burda tək-təkdir.

Berlin – o ölümlər, qanlar yuvası
İndi sükut edir, qatı bir sükut...
Nə qədər ağırdır onun havası,
Elə bil uzanmış bir qara tabut...

Uçuq divarlarda, ağaclarda qar.
Mart ayı olsa da, Berlində qışdır.
Bu il Avropada gecikmiş bahar,
Çiçəklər vaxtında açılmamışdır...

Deyinir küçədə kaftar bir qarı:
"Bu il təbiət də düşməndir bizə.
Berlinin qurumuş şam ağacları
Nizə tək sancılır gözlərimizə".

Bəs necə? Bu günü düşündünmü heç,
"Hayl Hitler!" deyib qışqıranda sən?
İndi daş yolları ayaqyalın keç,
Yenəmi cəllada səs verəcəksən?

Öz doğma balanı öyrətmədinmi,
Yüz riyakarlığa, yalançılığa?
Ana əllərinlə sövq etmədinmi
Onu quldurluğa, talançılığa?

Bir rus gözəlinin, bir gənc ananın
Qanlı paltosunu geyinəndə sən,
De, niyə donmadı bədəndə qanın,
Ağrı da keçmədi o daş qəlbindən?

Hələ sən şadlanıb sevindin də bir –
"Oğlum qəhrəmandır, faşistdir", – deyə.
İndi nəvələrin çörək dilənir,
Ötüb keçənlərə baş əyə-əyə.

Deyinir küçədə o kaftar qarı:
"Bu il təbiət də düşməndir bizə.
Berlinin qurumuş şam ağacları
Nizə tək sancılır gözlərimizə".

*1947*

## REYXSTAQ

Zabit nişan verir: "Budur Reyxstaq!".
Dörd divar qalmışdır ondan, dörd divar...
Nə bir sütun qalmış, nə dəmir bir tağ,
Canında neçə min güllə yeri var.

Divarlar hislidir, divarlar qara,
Onu seyr edirəm mən iftixarla.
Bizim ağır toplar o divarlara
Neçə mərmi vurmuş, yad et vüqarla!

Qatillər, casuslar yurdu bu bina
Meydan oxuyardı bir vaxt aləmə.
İndi peşimandır yarandığına,
Zülmün aqibəti beləymiş demə!

Burda lovğa-lovğa bir zaman Hitler
Deyərdi: "Berlinə qul olsun dünya!"
Fəqət baş əymədi bu təhqirə yer,
Yaşatdı torpağı başqa bir məna...

O gözəl mənadan ilham alaraq,
Uçdu Moskvanın təyyarələri.
Berlinə neçə min bomba salaraq,
Zəfərlə qayıtdı sovet əsgəri.

Avropa qurtardı ölümdən, qandan,
Xilaskar biz olduq dünyaya, dostlar!
Bu yolda can qoyan hər qəhrəmandan
Torpağın qəlbində neçə dastan var!..

Mənim də yurdumun mərd oğulları
Qanilə qol qoydu bu dastanlara.
Gəldikcə zamanın neçə baharı
Günəş də baş əydi hər gün onlara.

Dayanmış qarşımda ölü Reyxstaq...
Dörd divar qalmışdır ondan, dörd divar...
Nə bir sütun vardır, nə dəmir bir tağ,
İçində at çapır soyuq bir ruzgar...

Yağır Reyxstaqa lopa-lopa qar,
Skelet bürünür ağ bir kəfənə...
Ölür cahangirlər və qəsbkarlar –
Deyir seyr etdiyim bu qanlı səhnə.

*1947*

## ANA HEYKƏLİ

Mərmər abidələr, tökmə heykəllər
Bəzəkdir hər böyük, kiçik şəhərə.
Ah, düşünən başlar, yaradan əllər!
Qanad verirsiniz düşüncələrə...

Xəyal et, daşlardan, boz qayalardan
Bir surət yaradır bir heykəltəraş;
Sanki nəfəs alır canlı bir insan,
Yaşayır yüz əsrə, min əsrə sirdaş.

Boranlar, tufanlar keçir başından,
Neçə min qış görür, neçə min bahar.
Qəlpə də qopmayır təməl daşından,
Yaşayır alnında ölməz bir vüqar...

Yaşayır sənətkar, yaşayır sənət –
Nəsildən-nəsilə salam verərək!
Ah, ana təbiət, ana təbiət!
Ən böyük övladın insandır, gerçək!
Budur, Berlində də bir insan əli
Yaratmış bir gözəl ana heykəli.

Onun qarşısında, bayaqdan bəri
Dayanıb dalmışam düşüncələrə.
Şeriyyət yuvası – ana gözləri
Dikilmiş bir azad, bir xoş səhərə.

Sol əlində kitab, sağında qələm –
Ürfana çağırır o öz nəslini.
Onun baxışında duyduğum aləm
Andırır bir gözəl bahar fəslini.

Deyirəm, bəlkə də Marksı doğan
Elə bu qadındır, elə bu ana!

Deyirəm bu qadın bəlkə bir zaman
Döşündən süd vermiş yoldaş Telmana!

Toplar, topxanalar keçmiş başından,
Dayanmış o heykəl yenə vüqarla.
Dənizdə dağ kimi o zaman-zaman
Çarpışmış uğursuz qasırğalarla.

Nə barıt qoxusu, nə tüstü, nə his
Bir ləkə salmamış onun hüsnünə;
Öz nəsillərini çağırır səssiz
Ağasız, köləsiz xoşbəxt bir günə.

Dəyişir Berlində aylar, fəsillər
Çayların suyundan bağlar içdikcə;
İndi al bayraqlı, azad nəsillər
Heykəlin yanından gəlib keçdikcə.

Baxır igidlərə fəxr edir ana,
Hamı o surətə baş əyir bir-bir.
Berlinin azadlıq izdihamına
Elə bil heykəl də qoşulub gedir...

*1947*

## ALMAN BƏNNASI VƏ SOVET ZABİTİ

Daş yonub, qum yığan qoca bir usta
Dağılmış bir evi qurur yenidən.
O, kərpic qoyduqca kərpicin üstə,
Onun əllərini seyr edirəm mən.

Yetmişdən yuxarı olsa da yaşı,
Əllər o əllərdir, qollar o qollar.
Berlin evlərinin min təməl daşı
Bu güclü əllərdən qalmış yadigar...

O bəzən baxdıqca uçmuş şəhərə,
Dərdlərə qərq olur gözlərində qəm.
Hansı xəyallara, düşüncələrə
Onun getdiyini deyə bilmərəm!..

Dönüb yanındakı zabitə hərdən:
Soruşur: Tavariş! Doğru de, görək,
Bu təzə evlər ki, yaradıram mən
Yenəmi alovlar, odlar görəcək?
Yenəmi yanğınlar keçirəcək yer,
Alman uşaqları yetim qalacaq?
Tavariş, yenəmi başqa bir Hitler
Berlini alova, oda salacaq?

Zabit ehtiramla gülümsəyərək:
– Səndən asılıdır... Bir də sənin tək
Bu yeni Berlini yaradanlardan.
Doğma yurdunuzda, elinizdə siz
Faşistlər nəslini kəsə bilsəniz,
Nə Almaniya ölər, nə də bir alman!..

Usta dinlədikcə, soyuq qəlbinə
Bir yaz günəşinin istisi gəlir,

Yorulmuş əlləri birdən dincəlir.
Zabitə üz tutub dil açır yenə:

– Nə qədər xeyirxah insanlarsınız!
Ürəyiniz təmiz, üzünüz ağdır.
Bu böyük vicdanla siz ki, varsınız
Almaniya, doğrudan, yaşayacaqdır!

Onun sifətində rəqs edir şadlıq,
Yenə kərpic alır əlləri yerdən,
Qəlbində səadət, bir də azadlıq
Baxıb gülümsəyir zabitə hərdən...

*1947*

## RƏSSAMIN SON ƏSƏRİ

### I

O, qaranlıq bir dalanda açdı səhəri,
Gözlərindən yuxu kimi töküldükcə qəm;
Duman kimi dağıldıqca düşüncələri,
Bir anlığa zülmət oldu gözündə aləm.

O yeridi beş-on addım, dayandı birdən,
Nəfəs aldı, yeriməyə varmı taqəti?
Ayaqları tərpənmədi durduğu yerdən,
Dedi: "Buymuş qocalığın son səadəti!"

Tək qocalıq deyil onu taqətdən salan,
Neçə gündür, neçə gündür o rəssam acdır.
London boyda bir şəhərdə köməksiz qalan
O sənətkar çörək ilə suya möhtacdır...

"Hara gedim? Kimə deyim bu dərdimi mən?
Bircə parça kətana da yoxdur gümanım.
Qoca vaxtı kim tutacaq titrək əlimdən?
Yaman keçdi, yaman keçdi mənim dövranım...

Ona-buna əlmi açmaq? Dilənməkmi? Ah!
Dilənmək də qadağandır bizim şəhərdə.
Günəş neçin doğdu yenə, açıldı sabah?
Bu abırla necə gəzim mən küçələrdə?

Bu gündənsə, bu gündənsə öz əllərimlə
Qoy özümü birdəfəlik asım ağacdan.
Vidalaşım öz müqəddəs əməllərimlə,
Birdəfəlik can qurtarım bu ehtiyacdan".

Deyirlər ki, can şirindir. Qara gündə də
İnsan oğlu bir ağ günə ümid bəsləyir.

Bəzən ölüm ayağında, can üstündə də
Yer oğlu öz köməyinə göyü səsləyir.

Qoca rəssam yerə-göyə baxdı həsrətlə
Qəlbindəki arzulara əlvida deyə.
Elə bu dəm o, müqəddəs bir məhəbbətlə
Nəzər saldı dünyadakı min gözəlliyə.

"Xeyr! – dedi, – doymamışdır şair ürəyim
Məhəbbətin, gözəlliyin min nemətindən;
Can evində dustaq qalmış neçə diləyim.
Əllərim də yorulmamış öz sənətimdən.

Bircə fırçam, bircə qutu rəngim də vardır,
Bu dostlara vida deyib ölmək yaramaz!
Son əsər də, son əsər də bir yadigardır!" –
Deyə rəssam toxdaq verdi qəlbinə bir az.

Sənət eşqi, sənət eşqi! Nə sehrkarsan!
Tufanların qoynunda da odun sönməyir.
Ömrü boyu od içindən keçsə də insan,
Yenə sənin bu dünyadan üzün dönməyir!

**II**

Qoca rəssam addımlayır səndələyərək,
Gəlir asfalt döşəməli bir meydan üstə.
Ürək dinir: "Son əsəri bu meydanda çək,
Gəlib-gedən seyr eləsin qoy dəstə-dəstə!"

Fırçasını meydançada dolandırdıqca
Göy daşlara nəqş eləyir son nəqşəsini.
Qürub edən bir axşamı o andırdıqca,
Duyan varmı sənətkarın faciəsini?..

Saymazyana baxma ona, dayan bir anlıq,
Seyr et haman tablodakı ölən sənəti...

Britaniyanın göylərinə çökən qaranlıq
Pərdələyir vaxtsız sönən o şeriyyəti...

Varmı bizim aramızda, görəsən, hələ
Avropanı cənnət kimi xəyal edənlər?
Qoca rəssam vidalaşır əməllərilə,
Qəpik-quruş atır ona gəlib-gedənlər.

*1947*

# ZİYAFƏT

## I

Orta əsrlərdən qalma bir saray...
Yan-yana düzülmüş böyük salonlar;
Nə sayım! Bir deyil, beş deyil onlar,
Aynabənd qapılar açılmış tay-tay...

Mərmər döşəmələr üstə xalılar, –
Bəzisi Hinddəndir, bəzisi Çindən.
Hər kiçik nəqşədə bir od rəngi var,
Elə bil od çıxır zülmət içindən...

Xəyalı pəjmürdə, ürəyi səsdə,
Yaxır hind qızının qəlbini odlar;
Onun toxuduğu xalılar üstə,
Qol-qola tutuşub rəqs edir lordlar.

Neçə min möhtəkir gəlmiş bu axşam
Bu bol ziyafətdə müftə yeməyə!..
Donmuş ürəklərdə sönük bir ilham
Diplomat dililə sağlıq deməyə.

Xörəklər müxtəlif, şərablar rəng-rəng,
Zəncinin, həbəşin qanıdır onlar.
Afrika soyulur... Qan-tər tökərək,
Qul kimi çalışır orda milyonlar.

Yelpazəli xanım, fraklı serlər
Gülür toqquşduqca qədəh qədəhə.
Döşü nal medallı seçilmiş merlər
Onuncu əsrdə yaşayır hələ.

"Xüsusi hörmət var" bu axşam bizə –
Sovet dövlətinin elçilərinə.
Yüz sağlıq deyilir şərəfimizə
Düşmən can desə də, düşməndir yenə...

Dodaqlarda gülüş, ürəklərdə kin, –
Qurdu tanıyarlar qurd baxışından.
Deyin, şeir yazan bir bolşevikin
Qəlbi açılarmı lord alqışından?

Bu axşam o qədər qəzəbliyəm ki,
Qəlbimdə od tutub yanır intiqam.
Hirsimdən az qala sağ əlimdəki
Qədəhi bir lordun başına çırpam.

Məni qınamayın! Ağırdır, dostlar,
Qatillər evində məclis keçirmək.
Hər düşmən gözündə neçə hiylə var,
Onları duyduqca iyrənir ürək...

## II

Qarşımda üzünün dərisi çil-çil
Bir ledi dayanmış, əlində əlcək.
Əri yanındadır – cənab Çörçill
Mənə əl uzadır təzim edərək.

O, tox qaban kimi fısıldayır, bax!
Onun dərisindən süzülür yağı.
Qalın qaşlarını bərk-bərk çataraq,
Səssizcə qımışır iblis sayağı...

"Bakı! Bakı!" deyib, üzümə baxır,
Elə bil od tutub yanır bədənim.
Canımdan tüstülər, dumanlar qalxır,
Hirsimdən əllərim titrəyir mənim!

"Bəli! Bakılıyam! Öz şöhrətim var,
Mənim babam olmuş 26-lar...
Gərək yadınızdan çıxmamış ola!"
Baxır qoca iblis gülümsəyərək.
O sağa çevrilir, mən isə sola,
Bir mərmiyə dönür sinəmdə ürək...

*1947*

## MƏHƏBBƏT İLHAMA ÇAĞIRIR MƏNİ!

Yenə də yam-yaşıl geyinir dağlar,
Göz kimi durulur qaynar bulaqlar.
Əriyir güneylər döşündəki qar,
Yağış da isladır o göy çəməni,
Təbiət ilhama çağırır məni!

Ürək dil açır ki, sönməmiş odum,
Hücuma başlayır mənim söz ordum...
Könüllər mülkündə min yuva qurdum,
Unutmaz aləmdə sevən sevəni,
Məhəbbət ilhama çağırır məni!

Görürəm, dan yeri yenə sökülür,
Göydən yer üzünə nurlar tökülür.
Zəmilər, tarlalar üzümə gülür,
Gözümdə saralır sünbülün dəni...
Bu nemət ilhama çağırır məni!

Mən yaranmamışam göylər övladı,
Əzəl şöhrətimdir torpağın adı...
Bu eşqim çoxuna qismət olmadı,
Şairim! Aç, payla söz xəzinəni,
Şeriyyət ilhama çağırır məni!

O kimdir külüngü dağ kimi vurur...
Keçici bayraq da yanında durur.
Görürəm, o yeni bir dünya qurur,
Loğmanlar yazacaq bu qərinəni,
Bu hikmət ilhama çağırır məni!

Car çəkir çarxların çaxnaşıq səsi,
Qızır baltaların polad pəncəsi,
Yatmayır Muğanın, Milin gecəsi...
Səslənir Vətənin çölü, çəməni,
Bu qüdrət ilhama çağırır məni!

Çöllərə min dəstə komsomol gəlir...
De, Kürdən, Arazdan neçə qol gəlir?
Ay ellər, Muğanın ili bol gəlir,
Səhralar əmr edir: – yaz bu səhnəni,
Bu töhmət ilhama çağırır məni!

Boz dağın qoynunda bir dəniz vardır,
Çinarlar sahildə qatar-qatardır.
Həmdəmim ləpələr, göy dalğalardır,
Uçur qayıqların ipək yelkəni,
Bu sürət ilhama çağırır məni!

Aynabənd evlərin eyvanı sərin,
Yuyunur qoynunda al şəfəqlənir.
Hər batan axşamın, doğan səhərin
Hüsnü salamlayır min pəncərəni,
Səadət ilhama çağırır məni!

Şirvanda sayrışır bağlar-bağatlar,
Şenliklər yanında kişnəşir atlar,
Axır qoşun-qoşun ellər, elatlar,
Əlilə kəşf edir hər dəfinəni,
Bu sənət ilhama çağırır məni!

Muğana su gəlir, Milə su gəlir,
Axışıb öz eli, ulusu gəlir...
Torpağa insanın arzusu gəlir.
Bağrıma basıram ana Vətəni,
Bu ülfət ilhama çağırır məni!

Ürək dil açır ki, sönməmiş odum,
Hücuma başlayır mənim söz ordum...
Könüllər mülkündə min yuva qurdum.
Unutmaz aləmdə sevən sevəni,
Məhəbbət ilhama çağırır məni!..

*1948*

## BƏSTƏKAR

Böyükdür insanın eşqi, hünəri,
Həyat aşiqidir sənin də nəğmən.
Ürəkdir ən böyük sənət əsəri,
Ona bir yad kimi soyuq baxma sən.

Həyat yavrusudur müqəddəs ürək.
Sən onu küsdürmə özündən bir an
O, bəzən zülmətə qılınc çəkərək
Bizə yol göstərir qasırğalardan...

Ürəkdir insana ən yaxın sirdaş,
Dostluğu dar gündə unutmaz könül.
İlham pərisindən ayrılma, qardaş,
Onunla bir ağla, onunla bir gül!

Qəlbin açılmamış sirrləri var,
Yerlər də, göylər də ona tanışdır.
Hər kiçik zərrədə bir ümman axtar,
Hər pərdə üstündə dünya danışdır.

Çal, çal! Rübabından axıb süzülsün
Kamal dünyasının solmaz hünəri.
Çal ki, zəfər kimi ruhlara gülsün
Hər bahar axşamı, hər yay səhəri!

Sən ellər eşqilə yaşayıb-yarat,
Bizə bir yad kimi gəlməsin səsin.
Simində dil açsın anamız həyat,
Xəyal qanadlanıb, ürək titrəsin.

Sən sənət eşqilə vəcdə gələrək
Elin qapısına ayaq basdınmı?
Bir mağar gecəsi, dan üzünədək
İxtiyar aşığa qulaq asdınmı?

Qanında, qəlbində, de səhər-səhər,
Çayların ahəngi aşıb daşdımı?
De, külək əsdikcə, sıx meşəliklər
Sənin rübabında pıçıldaşdımı?

Yaz günü səhərin oğlan çağında,
Muğan düzlərindən keçdinmi atla?
Min turac ötdükcə ellər bağında
Göylərə uçdunmu sən o qanadla?

Əlində rübabın, bu gənc yaşında
Ulduzlar qəlbinə süzüb axdımı?
Gözlərin önündə dağlar başında
İldırım şaqqıyıb, şimşək çaxdımı?

Sən ellər eşqilə yaşayıb-yarat,
Bizə bir yad kimi gəlməsin səsin.
Simində dil açsın anamız həyat,
Xəyal qanadlanıb ürək titrəsin.

O sarı simlərin incədir qəlbi,
Ona mizrabını ehtiyatla vur.
Duyğusuz əlləri hiss edən kimi
O mehriban gözəl tezcə unudur...

Abbas Divarqanlı, Dilqəm, Ələsgər
Bir saza nə qədər dastan yaratdı.
Elin qüdrətilə yaşayan ərlər
Eşqin hünərilə murada çatdı.

Sən sənət eşqilə vəcdə gələndə,
Bir səməndər kimi odlara qalan.
Qoy bir el məsəli düzəldim mən də:
Dağ olmaq istəsən, dağa arxalan!...

Çəkinmə, qısqanma, bir xəyala dal...
Sən də öz eşqinin dastanını yaz.

Hökmünü indidən verir istiqbal:
Hünərsiz sənətin şəni ucalmaz.

Çal, çal rübabından süzülən məna
Dağların, daşların bağrını yarsın.
Sazında dil açan bu yeni dünya
Zəfərdən zəfərə bizi aparsın.

Çal, çal, azadlığın xoş təranəsi,
Hində, Himalaya, Çinə yayılsın.
Göyləri titrətsin inqilab səsi,
Onun şöhrətilə torpaq ayılsın...

Çal ki, baş qaldırır müstəmləkələr,
Can verir ağalar, qullar dünyası...
Bir bayraq altına qoşur ölkələr
Budur kommunizmin ilk simfoniyası!

Zülmət qanad gərmiş, Avropaya bax,
Artıq nə Bethoven, nə də Bayron var.
Göyün qəfəsinə sığmayır torpaq
Qurtuluş axtarır dustaq arzular...

Qardaş, bizə baxır dünyanın gözü...
Sən Yer kürəsini vüqarla dolan.
De kimdir yaradan ən böyük sözü? –
Bizim dünyamızda sənətkar olan!

Qoy bizə həsədlə baxsın Avropa!
Yaradan, yaşadan öz əlimizdir!
Biz qəlbi, idrakı tutmadıq topa,
Dünyanı fəth edən əməlimizdir.

Çal, çal, qalibiyyət bizimdir, bizim!
Dənizlər, ümmanlar çaxnaşır daha.
Hücum var, hücum var – deyir sosializm –
Günəşlə bir yerdə gedir sabaha...

*1948, 6 mart*

## İSLAM

### I

Oder çayı dolanmışdır gümüşü bir kəmər kimi
Vrotslavın gövdəsinə;
Şırıl-şırıl göy ləpələr axdıqca nəğmələr kimi,
Heyran olur öz səsinə.
Ağaclar da kölgə salır
Bu saf suyun aynasına.
Könlüm, gözüm heyran qalır
Su üstdəki ehtişamın –
Min ulduzlu bir axşamın
Ürək açan mənasına.

Çiçək sevən, şeir sevən bir millətin
Qəlbi kimi gülür bağlar...
Elə bil ki, insanlara töhfəsidir təbiətin
Göy təpələr, yaşıl dağlar.
Hələ bahar! Hələ bahar!
Polşanın yüz şəhərində,
Demə, gülsüz bir eyvan var,
Şairlərin rübabı tək,
Qəlbi dinir titrəyərək
Axşamın da, səhərin də.

Vrotslavda ayna kimi parıldayır gen küçələr,
Göy üzündən nur tökülür.
Dörd yüz bahar, almanlara bir qul olmuş yazıq şəhər,
Bu gün baxıb üzə gülür.
Dilə gəlir hər mənzərə:
“Yer azaddır! Yer azaddır!”
Hər ürəkdə bir pəncərə
Açılmışdır Şərqə sarı...
Gülür insan arzuları.
Hamı şaddır! Hamı şaddır!

## II

Fəqət məni düşündürən nə bu şadlıq, nə bahardır.
Unutmuşam hər varlığı,
Bu gün şair ürəyimdə dağ boyda bir kədər vardır.
Gəzirəm bir məzarlığı...
Baş daşları qatar-qatar
Gəlib keçir gözlərimdən;
Tanış adlar, familyalar
Nəqş olunmuş o daşlara...
Həlak olmuş yoldaşlara
Baş əyirəm hörmətlə mən.

Baş əyirəm yazısını oxuduğum qəbrin üstə,
Nə aydındır o yazılar!
Deyirəm ki, bu yazılar yazılaydı qəbrim üstə
Mən öləndə, əziz dostlar:
"O, el üçün keçdi candan,
O yaşadı insan kimi.
Demə öldü o qəhrəman,
O, müqəddəs diləklərdə,
Bir də təmiz ürəklərdə
Yaşayacaq dastan kimi".

Dolaşdığım qəbristanın nə ucu var, nə bucağı,
Min-min durur qəbir daşı.
Göy çəməndə yataq salmış bu qəbristan bahar çağı
Çiçək açır günə qarşı.
Günəş göydən nur ələyir
Dilsiz duran bu varlığa.
Qızlar da su səpələyir
Bu müqəddəs məzarlığa.

## III

Bir məzar daşına baş əyirəm mən,
Görürəm üstünə yazılmış "İslam".

Qəmlər bulud-bulud keçir qəlbimdən,
Od tutub alışır sinəmdə ilham.

Deyirəm: bəlkə də, özüdür ki, var...
O, qırxıncı ildə, rahat bir vaxtda
Qəlbində sönməyən böyük arzular,
Raykom katibiydi bizim Qazaxda.

O mənə ilk dəfə əl verən zaman,
Duydu bir-birini dost əllərimiz...
Oxudum o gəncin baxışlarından
Ki, birdir eşqimiz, əməllərimiz.

Qaməti sərv kimi, köksü irəli,
Qapqara saçları, qaşları vardı;
Bir cüt ulduz kimi gülər gözləri
Səhəri çox zaman çöldə açardı...

Yaşıl tarlalarda günəşdən qabaq
Əlini sıxardı qəhrəmanların.
Əvvəl qocalarla salamlaşaraq,
Halını sorardı dostum onların.

Tarlalar eşitcək onun səsini,
Onu yerişindən bilirdi hamı.
Duyardı hər kəsin öz nəfəsini,
Kənd yeri sevərdi yoldaş İslamı.

Tez-tez görünərdi xeyirdə-şərdə,
Nə qədər mehriban bir qəlbi vardı!
Döşünə döyməzdi o məclislərdə,
Hər yerdə bir işdən söhbət açardı.

Hər təzə imarət, hər bağça, hər bağ,
Tikilən hər məktəb, hər kitabxana,
Təzə paltar geymiş hər yetim uşaq,
Oğlunun toyunu görən hər ana,

Bu kənddən o kəndə çəkilən daş yol,
Hər yeni qələmə, hər yeni şitil,
Hər təzə pioner, təzə komsomol,
Bir bahar müjdəsi gətirən hər il,
Yer əkən, ot biçən hər qabarlı əl,
Hər gənc bəstəkarın ürək nəğməsi,
Hər insan qəlbində yanan bir məşəl,
Hər zəfər şerinin səadət səsi
Onun ürəyində yuva salardı;
O bizim dünyadan ilham alardı.

## IV

Qırx birinci ilin bir yaz səhəri
İslam da geyindi əsgər paltarı.
Son dəfə seyr edib göy zəmiləri,
Öpdü dönə-dönə, öpdü baharı.

Kürün sahilindən Oderə qədər
O neçə ölkənin suyundan içdi.
Daima dost oldu ona zəfərlər,
Alovlar içindən şir kimi keçdi.

Qanlar içində də onun ürəyi
Bir an soyumadı əməllərindən.
Hər kiçik arzusu, böyük diləyi
Sən oldun, oxucum, bu dünyada, sən!

O sənin uğrunda od-alov uddu,
Bahara yol açdı şaxtalı qışdan.
Neçə məktub yazıb hal-əhval tutdu
Hər vətən oğlundan, dostdan, tanışdan.

Ağzından od çıxan ağır topları
Oder sahilində qurdu yan-yana.
Mərmilər uçduqca Berlinə sarı,
Min salam göndərdi Azərbaycana.

## V

Əridi dağlarda axırıncı qış.
Qırx beşinci ilin səkkiz may günü –
Zəfər bayramına bircə gün qalmış
Bizə qurban verdi İslam ömrünü.

Cəbhə paltarını o çıxarmadı,
Bir də qılıncını görmədi qında;
Kürün yaz fəslini seyrə varmadı,
Süfrə də açmadı bulaq başında.

Yox, yox, ayrılmadı o bizdən, dostlar!
Yaşadı ən şirin xatirələrdə,
Hər il al geyinib gəldikcə bahar
Biz onu görürük min bir səhərdə...

İliç lampaları yanıb yan-yana,
Çıraqban olduqca kəndin axşamı,
Hər ağsaqqal ata, ağbirçək ana
Hörmətlə yad edir yoldaş İslamı.

Ellər çay üstdəki dəmir körpüdən
Keçdikcə piyada, ya da ki atla,
Ən əziz, ən şirin bir xatiratla
İslamı yad edir tanışlar hərdən.

Hər kim öz əlilə bircə şitil də
Basırsa anamız qara torpağa,
O şitil bir ağac olur bir ildə,
İnsana hörmətlə qalxır ayağa...

## VI

Polşa göylərinin dan ulduzları
Mavi üfüqlərdə söndükcə bir-bir,
Eşqi azad olmuş polyak qızları
İslamın qəbrini salama gəlir.

Kimisi su səpir o qəbrə, dostlar!
Kimisi gül əkir öz əllərilə.
Elə bil qəbrin də üstündə bahar
Dil açıb danışır əməllərilə!..

Hələ bahar dostu ağ kəpənəklər
Dolaşır o qəbri pərvanələr tək.
Ətrini yaydıqca güllər, çiçəklər,
Yerin yanğısını sərnidir külək...

Öpür bir-birini aylar, fəsillər,
İnsanlıq qovuşur arzularına.
İslama hörmətlə azad nəsillər
Baş əyir dünyanın xilaskarına!..

*1948, avqust*

## KÖRPÜNÜN HƏSRƏTİ

Araz qırağında dayandı qatar,
Elə bil qəlbim də dayandı bir dəm...
Sıxlaşdı göydəki seyrək buludlar,
Deyəsən, başıma dolandı aləm.

Başlar uzanmışdır pəncərələrdən,
O taya... o taya baxışır hamı.
Yanımda sevgilim ağlayıb hərdən,
Deyir ki, “ah, Araz, tut ilticamı,
Mənim Sara bacım indi hardadır?
İyirmi ildir ki, uzaqlardadır”.

Araz dağlar yarıb, qayalar dəlir,
Zamanın fikri tək axır sürətlə.
Qayalı dağlar da salama gəlir,
Elə bil baş əyir ona hörmətlə.

O tayda gördüyüm çardaqlı damlar
Xəyalı küsdürür bu kainatdan.
Gəzir kənd yanını seyrək adamlar,
Sanki baş götürüb gedir həyatdan...

Həyətlər bomboşdur, qapılar bağlı,
Evlər üz döndərmiş biri-birindən.
Torpaq nalə çəkir sinəsi dağlı,
Bir tüstü qalxmayır ocaq yerindən.

Kəndin üstündəsə bir qəbristanlıq
Qərq olur göylərin göz yaşlarına.
Yaşaran gözlərim baxır bir anlıq
Əyilmiş, yıxılmış baş daşlarına.

“Qayalı dağı” da duman almışdır,
O, dünya görmüşdür... Yaxşı bax ona!
Nə qədər cənazə yola salmışdır
Bir şəhər boydakı o qəbristana!..

Ah, ürək duyduqca bu səhnələri,
Adətim olmuşdur alışıb yanmaq.
Yanğına düşmüşdür könlüm şəhəri,
Böyük bir dərd imiş şair yaranmaq!

Şairim! Bu sözlər qalsın bir yana
Yaş ötür... qayıtma ricətlərə sən!
Bir şeir bağışla Azərbaycana,
Araz üstündəki bir daş körpüdən!

***

Qurmuş bu körpünü bir memar əli
Baş-başa çatılmış tağlar üstündə.
Xilqətdən yaranmış onun təməli,
Dayanmış qayalar, dağlar üstündə.

Kim bilir neçədir körpünün yaşı,
Şahidi min bahar, bəlkə min qışdır!
Fəqət bir kərpici, sadə bir daşı
Hələ öz yerindən oynamamışdır...

Toplar, topxanalar keçmiş üstündən,
Hələ daş sütunlar durur vüqarla.
Körpü Araz üstə düşdüyü gündən
Şir kimi döyüşür sərt dalğalarla.

Üzünə gün düşüb, şəfəq güləndə
Kərpici bir yaqut kimi qızarır.
Üstünə dağlardan duman gələndə
Sərt qayalar kimi o da bozarır.

Deyirlər, qış ağır gələndə tək-tək,
Körpünün üstündə tar bağlayır qar.
Qaranlıq yol salır yerdən göyədək,
Bir canavar kimi ulayır ruzgar.

Gözüm körpüdədir... Dayanmış qatar,
Elə bil saxlayır o bizi qəsdən.

Hanı zınqırovlu-yüklü karvanlar?
Bir quş da keçməyir körpünün üstdən...

Axşam qəribliyi dağlardan enir,
Sakit dərələrə bir həsrət çökür.
Araz gah parlayır, gah kölgələnir,
Bəzən də hıçqırır o hönkür-hönkür.

Gözüm körpüdədir... Dayanmış qatar,
Elə bil o qəsdən saxlayır bizi.
Körpünü basmışdır yabanı otlar,
Nə cığır görünür, nə ayaq izi...

Kim bilir, kim bilir, nə vaxtdan bəri
Bir insan keçməyir bu daş körpüdən
Elə bil yol çəkir onun gözləri,
Fəqət nə gələn var, nə də bir gedən.

O kimdir? Gözümə görünür bu dəm?
Kimdir o ixtiyar? Xəyaldır, nədir?
Yox, yox, o nə xəyal, nə əfsanədir,
Gördüyüm insandır, gözlərində qəm...

Çatıb qaşlarını körpüyə baxır,
Qəlbində dağ boyda sözümü vardır?
Başından tüstülər, dumanlar qalxır,
Cansız əlləri də qabar-qabardır...

Bildim, o memardır... O yaradandır.
Yaxın gəl, oxucum, bax əllərinə!
O Araz üstündə xeyli zamandır
Ağlayır xar olmuş əməllərinə...

Kim bilir, kim bilir, nə vaxtdan bəri
Bir insan keçməyir bu daş körpüdən.
Elə bil yol çəkir onun gözləri,
Fəqət nə gələn var, nə də bir gedən...

*1948, 28 oktyabr*

## EŞQ OLSUN SƏNƏTKARA!

Bir qocaman qartalın qanadları dayandı;
O bir daha qıy vurub, dağlardan keçməyəcək.
Dünya öz yerindədir, yenə səhər oyandı,
O, Vətən dağlarının suyundan içməyəcək.

Ah, o bir də göz açıb görməyəcək aləmi,
Dostlar ilə bir daha gəlməyəcək üz-üzə.
Susdu onun rübabı, sındı qurşun qələmi,
Yeni-yeni nəğmələr qoşmayacaq o bizə.

Ölüm sevinməsin qoy!.. Ömrünü vermir bada
El qədrini canından daha əziz bilənlər.
Şirin bir xatirətək qalacaqdır dünyada
Sevərək yaşayanlar, sevilərək ölənlər...

Budur, baxır üzümə, baxır sənətkar gözü,
Yenə gülür, danışır, nəfəs alır Üzeyir;
Süzülür qəlb evimə onun hər odlu sözü,
Rübabının səsində qanad açır min şeir.

Sənətkara eşq olsun! Eşq olsun qəhrəmana!
Açıq alınla gedir o yenə də cəbhəyə.
Xəyalı bir dəniz tək yenə gəlir tüğyana,
Kommunizmin bayrağı günəşə qalxsın deyə!

O sabah da bizimlə addımlayır yanaşı,
"Koroğlu"dan oxuyur yenə zəfər ordumuz.
Ey Füzuli şerinin bir bəstəkar qardaşı,
Şöhrət tapdı adınla bizim ana yurdumuz.

Ölüm sevinməsin qoy!.. Ömrünü vermir bada,
El qədrini canından daha əziz bilənlər.
Şirin bir xatirətək qalacaqdır dünyada
Sevərək yaşayanlar, sevilərək ölənlər...

Mən bu kiçik şerimi yazıram göz yaşımla,
Çünki vidalaşıram bir ürək sirdaşımla!

*1948, 24 noyabr*

## DEYİN, GÜLÜN, ÖVLADLARIM!

Şəhər üstə qanad gərib mürgülədi yorğun axşam...
Neçə çadır qurdu göydə topa-topa sıx buludlar.
Yavaş-yavaş qaraldıqca mavi sular, yaşıl otlar,
Çəkib məni öz ardınca evə saldı gəlin – ilham...
Şəhər üstə qanad gərib mürgülədi yorğun axşam...

Dağılmışdır meydanların, döngələrin izdihamı,
Seyrəlmişdir küçələrdə avtoların xəbər səsi.
Şəhər böyük, hər insanın öz zövqü var, öz həvəsi. –
Saraylara, teatrlara, kinolara dolmuş hamı,
Dağılmışdır meydanların, döngələrin izdihamı...

Mənsə bir ay görmədiyim masam üstə baş əyərək,
Deyirəm ki, salam verim şeir-sənət dünyasına...
Söz evini bomboş görüb at çapmasın əsən külək...
Ürək qoyub can yandırıb hər bir sözün mənasına,
Deyirəm ki, salam verim şeir-sənət dünyasına.

Ürək böyük, arzular çox, yollar uzun, səbrimsə az...
Ah, deyirəm, qıra bilsəm zəncirini ətalətin...
Dolmuş ürək boşalmasa can yanğısı sakit olmaz,
Yaratmaqdır, yaratmaqdır al bayrağı səadətin!
Ah, deyirəm, qıra bilsəm zəncirini ətalətin!..

Bu fikirlər dünyasına əyilmişdir yenə başım,
Sanki mənə qulaq asır sakit olmuş böyük şəhər...
Ağ kağıza kotan kimi şırım açır karandaşım,
Hərdən gəlir qulağıma qəlbimdəki döyüntülər,
Sanki mənə qulaq asır sakit olmuş böyük şəhər...

Ev o qədər səssizdir ki!.. Nə danışan, nə gülən var.
Kəsilmişdir uşaqların ağız dolu qəhqəhəsi.
Danışmayır hər zamankı qarmon səsi, kaman səsi.
Bəzən uşaq dünyasını nə anlayan, nə bilən var;
Ev o qədər səssizdir ki, nə danışan, nə gülən var.

Yusif alıb fırçasını şəkil çəkir bir kənarda.
Nəsə qurub-quraşdırır kiçik-kiçik tablolarda.
Aybəniz də sağ əlini söykəmişdir çənəsinə,
Divan üstə qulaq asır nağıl deyən nənəsinə.
Vaqif də ki, yuvarlanır, gah da dönür üzü üstə;
Xumarlanır pişik kimi anasının dizi üstə!

Onlar neçin danışmayır, neçin gülüb oynamayır?
Neçin mənim təbim kimi bulaq olub qaynamayır?
O körpəcik ürəklərdən nələr keçir indi, nələr!
Nənəm deyir: – səs salmayın! Əsər yazır atan, əsər...
O hər şeir oxuduqca, dağa dönür ürəyimiz;
Onun halal zəhmətilə qazanılır çörəyimiz!

– Yox, yox, əziz balalarım! Heç qısmayın səsinizi,
Sizin şaqraq dilinizi eşitməsəm bir anlıq mən,
Qaya boyda daş asılar mənim ata ürəyimdən...
Gülər görüm, oynar görüm, xoşbəxt görüm hər vaxt sizi.
Gülün, əziz balalarım! Heç qısmayın səsinizi!

Mən görmüşəm uşaqlıqda çörək dərdi düşünəni –
Anam soyuq bir daxmada ac qarına doğdu məni...
Sizə nə var, övladlarım, görmədiniz o pis günü.
Görmədiniz yoxsulların xəcalətdən öldüyünü.
Görmədiniz qələm qaşlı, durna gözlü o gəlini,
Can üstündə mənə sarı uzatmışdı öz əlini...

Siz işıqlı, yaraşıqlı binalarda yarandınız,
Səadətdir ilk eviniz, azadlıqdır ilk andınız!
Boynunuza al qırmızı qalstuklar taxanda siz,
Bilirəm ki, mənsiz belə xoşbəxtlikdir nəsibiniz...
Bilirəm ki, sizin kimi sabahın da şaddır üzü...
Gözəl günlər ana kimi oxşayacaq ömrünüzü.

Elin qadir əllərilə çoxaldıqca elin varı,
Atasız da ömür sürür min-min vətən balaları.
Bir əbədi al bahara təslim oldu boranlı qış...

Sabahın duz-çörək dərdi alnınıza yazılmamış...
Bir də məndən çəkinməyin, sükunətə düşmənəm mən,
Səssiz keçən günlərimi saymamışam öz ömrümdən...

Mən əzəldən tufanların qoynunda bir ötən quşam,
Fırtınalar, qasırğalar qucağında doğulmuşam...
Ağır toplar dilə gəlib səs saldıqca dağ dalına,
Mənim şair ürəyim də dönür dağlar qartalına.
Şirlər kimi çox çıxmışam yanğınların arasından;
İgid igid ola bilməz qan axmamış yarasından.

Polad kimi, odda bişib bir mərmiyə dönsə ürək,
Sözün hökmü meydan sürər uzaq vuran mərmilərtək.
Deyin, gülün, övladlarım! Sükunətə düşmənəm mən,
Səssiz keçən günlərimi saymamışam öz ömrümdən.
Deyin, gülün, əl də çalın, heç qısmayın səsinizi,
Gülər görüm, oynar görüm, xoşbəxt görüm hər vaxt sizi!..

*1949, 25 mart*

## DİNLƏ, XAVƏR!

Başımın üstünü kəssə də ölüm
Sağ əli baltalı bir cəllad kimi,
Mənim taleyimə yanma, sevgilim!
Lakin bu dəhşətə baxma yad kimi...

Solsa da qüssədən al yanaqların,
Sən bu müsibəti qəlbində saxla...
Dil açsın hər yerdə gül dodaqların
Bir əxlaq, bir sevgi, bir qanacaqla.

O zaman mənim də ruhum şad olar,
Qəbrim çiçək açar bu ülfətinlə;
Sorsalar nə qaldı məndən yadigar?
Dayan heykəl kimi məhəbbətinlə!

*1949, may*

## ANA VƏ KÖRPƏ

Yay günü... Yol üstü... Ağac kölgəsi...
Kölgədə bir gəlin oturmuş yalqız;
Od tökür başına göyün nəfəsi,
Yatır qucağında südəmər bir qız.

Uşaq yuxusunda qımışıb gülür,
Tamam qapanmamış ala gözləri.
Onun saf üzündən nurlar tökülür,
Elə bil açılır bir yaz səhəri.

Axışıb atlılar, arabalılar
Kəndlərə qayıdıb gedir şəhərdən.
Nə hava tərpənir, nə meh, nə ruzgar...
Quşun da nəfəsi təngiyir hərdən.

Duyub körpəsinin hər bir halını,
Ana sığınmışdır bu kölgəliyə.
Uşağın üzünə çəkir şalını,
Günəş gözlərinə düşməsin deyə.

Yol üstə dincələn o gəlin kimdi? –
Şəhərdən qayıdır, kəndə gedəcək.
Uşaq yuxusunu alacaq indi;
Ana öz yoluna davam edəcək.

*1949, 6 iyun*

## DÜŞÜNCƏLƏR

Gah olur ki, ovçu könlüm dağlar aşaraq,
Asta gedib, ağır gəzib, ellər dolanır...
Səssiz keçən günlərimlə vidalaşaraq,
Haray çəkib, qıy qoparıb çöllər dolanır.

Bir quşcuğun uçuşunda, bilsəniz, nələr,
Nələr duyur bir şairin səyyar ürəyi;
İnsaf elə, deyilmidir canlı bir əsər
Yaşıl meşə, yaşıl tala, maral sürəyi?..

Laçın qopur yuvasından öz sürətilə,
Qoca dağlar baş qaldırıb boylanır göyə;
Kim uçmayır öz qəlbinin şeriyyətilə?..
Kim baxmayır bu aləmə – yüksəliş, – deyə?..

Bu dünyanın xəritəsi bir rəngdə deyil,
Hər surətin öz nəqşi var bir əzəl gündən...
Qoca palıd əyilmədən yaşayır yüz il,
Qopanda da vüqar ilə qopur kökündən!

O ölməyir, heç ölərmi cahanda vüqar?!
Zaman keçir, budaq atır körpə şitillər...
Bir əlində yaz günəşi, birində bahar,
Neçə bayram qarşılayır bizim nəsillər.

Gah da açıb qollarımı bir ruzgar kimi,
Karvanımı eldən-elə sürüb köçürəm;
Ürəyimdə bir dünyanın gücü var kimi,
Dənizlərdən dənizlərə üzüb keçirəm.

Qaya boyda dalğaların polad cərgəsi
Sinəm üstdən aşıb keçir neçə qatarla.
Neyləyəcək iradəmə dəniz lərzəsi?
Kim istəməz çarpışmağı fırtınalarla?!

Arabir də sakit axan bir su yanında
Fikrə gedib danışıram yalnız ürəklə;
Arzularım çaylar kimi axır qanımda,
Kimin qəlbi döyünməyir min bir diləklə?

Deyirəm ki, uzaq yolda susuzluq çəkən
Bir insanın yollarında bulaq olaydım...
Bütün məslək dostlarımın bu dünyada mən
Hər qəminə, nəşəsinə ortaq olaydım!

Deyirəm ki, qanadını gərəndə hicran,
Birləşdirim ayrı düşmüş dost əllərini;
Həsrət çəkən sevgililər qovuşan zaman
Şerə düzüm bu vüsalın əməllərini.

Bir quşcuğun yuvasını yıxanda ruzgar,
Dimdiyimdə çör-çöp yığıb yuva quraydım...
Qanad açıb dirçələndə körpəcə quşlar,
Çolpaları yuvasından mən uçuraydım.

Deyirəm ki, rast gəldiyim bir yetim uşaq
Ata desin, ata bilsin məni görəndə.
Kim istəməz yıxılanın dayağı olmaq?
Kim sevinməz bir xeyirxah ömür sürəndə?
Gah olur ki, yer altında əlimdə çıraq,
Şaxtalarda külüng vurub mədən qazıram.
Gah da dönüb bir ağ saçlı hakim olaraq,
Çörçill ilə Trumenə ölüm yazıram.

Buruq qurub neft çıxaran qəhrəmanların
Baltası tək qayaları özüm yaraydım.
Yer altına yer üstdəki mərd insanların
Hər sözünü, salamını mən aparaydım.

Deyirəm ki, yer üzünü gəzib bir zaman,
Yetimlərin naləsinə qulaq asaydım.

Cahangirlər dünyasını dar ağacından
Öz əlimlə, öz əlimlə tutub asaydım!

Yaz günəşi saçlarını düzə yayanda,
Yer şumlayıb, toxum səpib, taxıl əkəydim;
Təpəl öküz bürkülənib diz qatlayanda,
Bir kotana qayış olub özüm çəkəydim.

Tarlaların bəndlərini qıranda sellər,
Bir sədd olub qabağını kəsə biləydim.
İlan kimi dil çıxarıb yananda çöllər,
İlk baharın nəsimi tək əsə biləydim.

Deyirəm ki, istiqbala məndən yadigar
Nə şöhrətim, nə heykəlim, nə adım olsun;
Döyüşlərdə zəfər çalan mərd qəhrəmanlar
Cərgəsində əsərimlə övladım olsun!

Deyirlər ki, soyuyacaq Günəş bir zaman;
Düşündükcə o zavallı, o "axır" günü...
Bu dünyaya neçə min il gəlib sonradan,
Gücüm çatıb uzadaydım günün ömrünü...

Öz əlimlə inci kimi sapa düzəydim
Aylarını, illərini əbədiyyətin...
Göy üzündə günəş ilə qoşa gəzəydim,
Yer üzündə mən olaydım hüsnü xilqətin...

Deyirəm ki, bayram günü çöldə, çəməndə
Ürəklərə nəğmə tutan bir ney olaydım.
Mən özümü bu dünyada, dünyanı məndə
Dərk eləyib, məna dolu hər şey olaydım...

Bir arzunun övladıdır hər kiçik əsər...
Düşünürəm. Dilə gəlir qəlbimdə bir səs,
Deyir: – Şair! Xoş olsa da bu düşüncələr,
Bir kainat bir ürəyə sığışa bilməz...

*1949*

## QOCA ŞƏRQƏ GÜNƏŞ DOĞUR...

Yalnız dünən dənizlərin ağır toplu gəmiləri
Sahillərə lövbər saldı.
Don üstünün, Kür üstünün sarı buğda zəmiləri
Sərin-sərin nəfəs aldı
Yaz gününün havasıyla.
Bağlar sərin sular içdi,
Gözəllər al geyib keçdi
Ağacların arasıyla...

Yalnız dünən pəncərələr açdı qara pərdəsini,
Salamladı bizi səhər...
Yerdə insan, göydə qartal ötdü zəfər nəğməsini:
Qalib gəldi bizimkilər
Qanlı faşist dünyasına!
Biz ölümə qəbir qazdıq,
Nəğmə qoşub şeir yazdıq
Məhəbbətin mənasına!

Öz qarnını balıq kimi yarıb tökən samuraylar
Göz dikmişdi yurdumuza.
Koreyada salam verdi soyuq qışlar, isti yaylar
Bizim zəfər ordumuza!
Su üstündə sonalar da
Səhər vaxtı
Bizə baxdı...
Ağbirçəkli analar da
Duz çörəklə çıxdı yola:
Dostlarımız gəldi, budur!
Bu qurtuluş ordusudur!
Uğur ola! Uğur ola!

Deyirlər ki, Koreyanın gül fəslidir avqust ayı,
Min rəng çalır göy çəmənlər;
Düzənlərdə çiçəklərin, lalələrin yoxdur sayı.
Gəlin donlu yasəmənlər

Əyləşdikcə öz taxtına,
Səsləndikcə axar sular,
Danışdıqca saf duyğular,
Yer sevinir öz baxtına.

Deyirlər ki, yamyaşıldır göy zəmilər orda hələ,
Yazıq kəndli biçməmişdir,
Tarlasının yetişməmiş çəltiyini öz əlilə.
Hələ yeyib, içməmişdir
Zəhmətinin ilk barından;
Su yerinə qəmlər içir,
Soyuq yellər əsib keçir
Onun taxıl anbarından...

Koreyanın göylərinə divan tutur təyyarələr
Şəhərlərə bomba yağır.
Yerdə işıq görünməyir, göy üzündə səyyarələr;
Qara torpaq ağır-ağır
Od içində nəfəs alır.
Cəbhələrə gedir kəndli,
Dən-dən olmuş bərəkətli
Göy zəmilər yetim qalır.

Yetim qalır tifillər, ah ayrı düşür sevgililər,
Ayrı düşür dost əlləri!
Bu həsrəti həsrət çəkən qəhrəmanlar duya bilər.
Sönür eşqin əməlləri
Külək vurmuş şamlar kimi.
Ərşə min bir ah dayanır.
Qəlblərdə məşəllər yanır
Alovlu ilhamlar kimi...

Fikrim gəzir o yerləri oymaq-oymaq, şəhər-şəhər,
Yanır evlər, yanır yurdlar!
Top səsindən çınqıl kimi səpələnir pəncərələr.
Hələ keçən o tabutlar!

Ah, o ölən qəhrəmanlar!
Yer də, göy də qara geyir,
Qisas deyir, qisas deyir
O sel kimi axan qanlar!

***

Koreyanın sularında kiçik-kiçik adalarda
Vaşinqton topları var.
Anaların körpələri kabab olur cidalarda;
Ah analar! Ah analar!
Çaylar kimi axır qan da
Dalğa-dalğa, axın-axın.
Buna “tale” deyir, baxın,
Yer allahı Vatikan da

Baxıb Harri Trumenə, xeyir-dua verir ona;
Xeyir-dua verir alçaq
O qatilə, o cəllada, cəmdək yeyən o quzğuna.
Qara torpaq! Qara torpaq!
Sənin dərdin nə böyükdür!
Az deyilmiş cahangirlər,
Az deyilmiş möhtəkirlər,
“Allahlar” da sənə yükdür!

Hanı Marks, hanı Volter, hanı Didro, Heyne hanı?
Hanı tom-tom o kitablar?
Hanı idrak dünyasının işıq saçan min dastanı?
Qəlb oxşayan o rübablar
Avropada qadağandır!
Bu zülmətə “cənnət” deyən,
Yerdə “allah” donu geyən
Vatikandır, Vatikandır!

Trumen də Allah sevir, kilsələrdən gəlir səsi,
Dua verir səhərlərə.

Elə bu vaxt Koreyada Vaşinqton təyyarəsi
Bomba tökür şəhərlərə;
Daş saraylar külə dönür,
Leş-leş üstə, baş-baş üstə.
Daş qalmayıb bir daş üstə,
Xanimanlar yanıb sönür.

Tarixlərin ilk övladı abidələr od tutur, ah!..
Haray çəkir qoca memar...
Tüstü göyü bürüdükcə gün tutulur sabah-sabah,
Qara geyir asimanlar,
Qara geyir binalar da,
Neçə şəhər viran qalır;
Öz əlinə tüfəng alır
Oğlu ölmüş analar da.

***

Göz qoyuram göy çəməndə həlak olmuş bir gəlinə,
Qucağında körpəsi var.
Üç axşamdır matəm tutur o gözəlin heykəlinə
Göydə yanan ağ ulduzlar
Damla-damla düzüldükcə,
Göz yaşı tək süzüldükcə,
Anasının döşlərini gəzir tifil öz əlilə,
O bilməyir ölüm nədir...
Ana nə tez vidalaşdı öz bəxtinin əzəlilə!
Bütün dünya fikirdədir.
Fikirdəyik sən də, mən də,
O tifil də... O çəmən də...

***

Yanır çayır, yanır çəmən, quşlar yad ellərə qaçır.
Alov tutur yamacları.
Qatar-qatar məşəl kimi qaranlığa işıq saçır
Alışan sərv ağacları...

O məşəllər yana-yana,
Hər fədakar qəhrəmana
Yol göstərir gecə yarı,
Gedir zəfər orduları.

Qana batmış köynəyini bayraq tutan qəhrəmanlar
Atəş açır od içində.
Alovlardan keçə-keçə od parçası olur onlar.
Alqışlayır bunu Çin də,
Hindistan da, Azərbaycan da,
Braziliyanın elləri də,
Asiyanın çölləri də,
Bütün göy də, bütün yer də!

Bütün dünya dilə gəlir bir rübabın simləri tək:
Dostlar! Uğur olsun sizə!
Göylər qızı o günəş də ədalətə səs verəcək:
Alqış sizin eşqinizə!
Alqış sizin yurdunuza!
Mən də sizi alqışladım,
Bu şeirimi bağışladım
Sizin zəfər ordunuza!

Trumen də qulaq asır yer üzünün bu səsinə.
Qulaq asır o cəllad da;
O, sabahı düşündükcə lərzə düşür gövdəsinə.
Bir qanun var bu həyatda:
Öz baxtına bütün insan
Bircə ulduz seçəcəkdir;
Kommunizmin dünyasından
Bütün aləm keçəcəkdir...

*1950, 9 sentyabr*

## KİÇİK ŞƏHƏR

Arazdan arx gəldi, su gəldi Milə,
Bir ilə salındı kiçik bir şəhər.
Yer qazdı, daş yondu insan əlilə
Dayandı üz-üzə aynabənd evlər.

Hər ev qabağında kiçik bir bağ da,
Yazın oğlan vaxtı gül açdı rəng-rəng.
Dünən qamış bitən qara torpaqda,
Bu gün şəfəq kimi sayrışdı çiçək.

Hopduqca səhranın gövdəsinə su,
Tərlədi qaxsımış bir bədən kimi.
Yerdə çiçək açdı yerin arzusu,
Sevindin, oxucum, sən də mən kimi.

Gürzələr, şahmarlar Araz boyunca
Paslı qılınc kimi çəkildi qına.
Yaşıl məxmər kimi döşəndi yonca
Vətən qızlarının ayaq altına.

Mildəki qarağan, yovşan yerinə
Çinarlar boy atdı cərgələnərək.
Ağaclar bənzədi biri-birinə
Bir ana südünün övladları tək.

Sünbüllər dirçəlib, qalxdı ayağa,
Yaşıl zəmilərə döndü yamaclar.
Ceyran sürüsünü çəkdi uzağa,
Uçuşub bağlara doldu turaclar.

Açıb yaxasını bir insan kimi,
Meşə kölgəsində sərnidi hava;
Radio dil açdı bir dastan kimi,
Gah Bakı danışdı, gah da Moskva.

Sovxoz direktoru oyandı səhər,
Başında fikirlər çıxdı eyvana.
Ayağı altında bir kiçik şəhər,
Baxdı səhra boyu, baxdı hər yana.

Düşündü, düşündü bizim qəhrəman,
Qurduğu şəhərə baxdı vüqarla;
Elə bil nur yağdı baxışlarından,
Sabahı düşündü o, iftixarla...

Sabahı seyr etdi öz nəzərilə,
Bir anda fikrindən yüz illər keçdi.
Bu kiçik şəhərin küçələrilə
Gözündən nə qədər nəsillər keçdi...

*1950, 30 mart*

## XAVƏRƏ

Ağzı xeyir sözlüm, incimə məndən,
Yar yardan ayrılmaz, bülbül çəməndən.
Demə ki, düşmüşdür saçlarıma dən,
Ürək qocalmayır, ürəyim sənsən.

Mən qul olmamışam şöhrətə, ada,
Sənsiz yaşamayım bir gün dünyada.
Gözəllər, cananlar min-min olsa da,
Mənim bu dünyada mələyim sənsən.

Könül heç doyarmı sən tək gözəldən,
Sən oldun qismətim hökmi-əzəldən.
Sağ olsun bu xeyir işi düzəldən,
Müqəddəs əməyim, diləyim sənsən.

Yusifin, Vaqifin görüm var olsun!
Aybəniz hamıdan bəxtiyar olsun!
Yüz il də Vurğuna Xavər yar olsun!
Ən əziz sirdaşım, köməyim sənsən!

*1951, 3 aprel*

## BOLQARISTAN HAQQINDA

Yam-yaşıl Bolqar göylərini
Qartal kimi dolaşan
Və yam-yastı
Bolqar dağlarının üstündən aşan
yel atlı
yel qanadlı
təyyarəmiz
Dostlar torpağına ayaq basdı.

Günəş altında
Yaqut kimi qızaran
al bayraqlar
Şəfəqlərə boyanmışdır.
Onları bir-bir
Seyr etdikcə mən,
Sinəmin içindən
bir səs gəlir:
Torpaq oyanmışdır,
insan oyanmışdır.

İşıq bol,
hava şəffafdır.
Dağlar ətəyindədir təyyarə düzü.
Bizi hörmətlə qarşılayan
dostların gülər üzü.
Əllərindəki çiçək kimi safdır,
İşıq bol, hava şəffafdır.
Düşmən üstünə
İki cahandan
hücum çəkərək
Zəfər çalmış bir ordunun
Əsgərləri tək
Görüşürük biz
Şaddır, döyünür ürəklərimiz.

Sən,
Elə zənn etmə ki,
Ahənrüba kimi
birləşən
Sadə əllərimizdir.
Yox, yox.
Bu ülfət
və məhəbbət
Vətənin eşqilə alışıb-yanan
Yanar dağlar kimi
alovları ərşə dayanan
əməllərimizdir.
İşıq bol,
Hava şəffafdır.
Dağlar ətəyindədir təyyarə düzü
Bizi hörmətlə qarşılayan
Dostların üzü
Əllərindəki çiçəklər kimi safdır
işıq bol,
hava şəffafdır.

*1951, 12 sentyabr*

## ALLAHYAR CAVANŞİRƏ

Ağır yatan ovçu dostum,
Gözlərini aç daha,
Az qalmışdır sabaha.
Oyan dostum, geyin gedək,
Lap dan yeri sökülür,
Quba qazlar, yaşılbaşlar,
Araz üstə tökülür.

Ay da gəlib daxmamızın
Qapısında dayanmış.
Yolumuza yuxa yayan
El qızı da oyanmış.

Alaseyrək tüfəng səsi,
Eşidirəm uzaqdan,
Tulalar da zingildəşir,
Gedək deyir bayaqdan.

Oyan, ancaq acıqlanıb,
Yenə məni söymə gəl.
Hər yuxudan kal duranda
Öz başına döymə gəl.
Oyan dəli-dolu dostum,
Gözlərini aç daha,
Az qalmışdır sabaha.

*1951*

## BELƏLƏRİ DƏ VAR

Göz aldadan bir su kimi
Gah lal axar asta-asta,
Gah da mələr quzu kimi,
Ürək yaxar asta-asta...

Nə bir toya, nə bir yasa
İstəməz ki, ayaq basa.
Adam ölüb, ev də yansa,
Durub baxar asta-asta...

“Yüz yol ölçər, bir yol biçər”,
Təmiz suyu üflər içər...
Dediyinin üstdən keçər,
Altdan çıxar asta-asta...

Özü qorxaq, cüssəsi dar,
Andını da tez unudar.
Sözlərini çeynər udar,
Hey udqunar asta-asta...

O “mərd” olar yaxşı vaxtda,
Çox danışar hünər haqda.
Çətin işdə, bərk ayaqda
Tez sıpıxar asta-asta...

Ürəyi buz, nəfəsi qar,
Üzdən gülər, üzdən yanar...
Az işləyib, çox qazanar,
Ancaq tıxar asta-asta...

O aşkarda girər qına,
Qıfıl vurar öz ağzına.
Xəlvətdəsə ona, buna.
Ləkə yaxar asta-asta...

Nə yaradar, nə də qurar,
Yaradana ağız burar.
Quyu qazıb, tələ qurar,
Ev də yıxar asta-asta.

“Tilsimlidir o qəhrəman”,
Qan da axmaz yarasından.
Odun-suyun arasından
Üzə çıxar asta-asta...

*1953, 26 yanvar*

## MÜXƏNNƏT

*"Kirpi"! Bir müxənnət tanıyıram mən,*
*Yəqin tanıyırsan birini də sən.*
*Vaxtında ellərə xəbər verməsən,*
*Qudurub həddini aşar müxənnət,*
*Yüz il də gizlənib yaşar müxənnət...*

Sən birinin ayağını yalardın,
Yüz birini quduz kimi dalardın,
Ürəkləri, beyinləri talardın,
Yaman getdi... getdi "şefin", müxənnət,
Din, necədir indi kefin, müxənnət?

Gözlərində iki parça buz donub,
Anan səni yaman uğursuz doğub,
De, əllərin neçə günahsız boğub?
Yaman getdi, getdi "şefin", müxənnət,
Din, necədir indi kefin, müxənnət?

"Yuxarı"da it kimi yallanırdın,
Yeyib-içib yaxşıca hallanırdın,
"Aşağı"nın üstə naxallanırdın.
Yaman getdi... getdi "şefin", müxənnət,
Din, necədir indi kefin, müxənnət?

"Səssiz!" – deyib başqasını sıxardın,
Özün evdə lap cıdıra çıxardın,
Min daş atıb aşiyanlar yıxardın.
Yaman getdi... getdi "şefin", müxənnət,
Din, necədir indi kefin, müxənnət?

Yalanları qılınc kimi yağladın,
Ürəkləri, ciyərləri dağladın,
Evlər yıxıb, hey qapılar bağladın.
Yaman getdi... getdi "şefin", müxənnət,
Din, necədir indi kefin, müxənnət?

Vurğun ellər aşiqidir əzəldən,
Ellər olur hər müşkülü düzəldən,
İndi başın yumruq yeyir yüz əldən,
Olmayacaq bir də "şefin", müxənnət,
Din necədir indi kefin, müxənnət?..

[*1953*]

## ŞAİR, NƏ TEZ QOCALDIN SƏN?!.

Nemətsə də gözəl şeir,
Şair olan qəm də yeyir.
Ömrü keçir bu adətlə,
Uğurlu bir səadətlə.
Görən məni nədir deyir:
Saçlarına düşən bu dən?
Şair, nə tez qocaldın sən!?

Dünən mənə öz əlində
Gül gətirən bir gəlin də
Gözlərində min bir sual
Heykəl kimi dayandı lal...
O bəxtəvər gözəlin də
Mən oxudum gözlərindən:
Şair, nə tez qocaldın sən!?

Ovçuluğa meyil saldım,
Gecə-gündüz çöldə qaldım,
Dağ başından enib düzə
Bir ox kimi süzə-süzə
Neçə ceyran nişan aldım;
Cavab gəldi güllələrdən:
Şair, nə tez qocaldın sən!?

Bəzən uca, bəzən asta,
Ötür sazım min sim üstə.
Andı yalan, eşqi yalan,
Dostluğu da rüşvət olan,
Ürək yıxan bir iblis də
Üzəvari deyir hərdən:
Şair, nə tez qocaldın sən!?

Saç ağardı, ancaq ürək
Alovludur əvvəlki tək.

Saç ağardı, ancaq nə qəm!
Əlimdədir hələ qələm...
Bilirəm ki, deməyəcək
Bir sevgilim, bir də Vətən:
Şair, nə tez qocaldın sən!?

*1953*

## A “DOSTLAR”

Yetər bu ayrılıq, bu fitnəkarlıq,
Fitnənin axırı nədir, a “dostlar”?
Sizdəki bu həsəd, bu gözü darlıq,
Gəncliyə bir əyan dərsdir, a “dostlar”.

Böyük bir hünərim yoxdur, bilirəm,
Bəzən öz-özümə baxıb gülürəm.
Artıq can üstəyəm, artıq ölürəm,
Şöhrətim quru bir səsdir, a “dostlar”...

Tərpətməyin məni durduğum yerdən,
Bir gül çiçəklənməz ayrılsa yerdən...
Yoxsa şimşək olub oynaram birdən,
Mənim bir damarım tərsdir, a “dostlar”.

Əzəldən aşiqəm şerə, sənətə,
Küsməyin məndəki bu bədahətə.
.....................................................
Vüqarım hər zaman şəsdir, a “dostlar”.

Başından yekələr çox qudurmasın,
Yalandan üzümə gəlib durmasın.
Hər yetən qıçıma bir diş vurmasın,
Yaxamdan əl çəkin, bəsdir, a “dostlar”!

Hər gülün taleyi öz əlindədir,
Sirrimi verməzəm, çox dərindədir.
Şairin şöhrəti əsərindədir,
Sizə son cavabım “yest!”dir, a “dostlar”!

[*1953*]

## BAHAR DÜŞÜNCƏLƏRİ

Bahar, istəklimsən başdan, binadan,
Ən gözəl qızısan sən təbiətin!
Xoşbəxt yaranmısan xoşbəxt anadan;
Gözünün odusan şerin, sənətin,
Ən gözəl qızısan sən təbiətin!

Sənin də şair tək qanın qaynardır,
Yerdə arzuların gül açır rəng-rəng.
Başında daima fikirlər vardır,
Daima döyünür sinəndə ürək,
Yerdə arzuların gül açır rəng-rəng.

Sükuta düşmənsən əzəldən sən də...
Nə yatır, nə də bir sakit olursan.
Çöllərə neçə min xalı sərsən də,
Çarpışıb yağışla, boranla, qarla –
Qışın son nəfəsi – qasırğalarla –
Sən də döyüşlərdə yaşa dolursan,
Nə yatır, nə də bir sakit olursan!

Buludlar qoynunda çaxan şimşəyin
Sivri qılınc kimi sıyrılır qından.
Tufan da qoparır bəzən küləyin,
Dağlara səs düşür qışqırığından...

Bahar! Qoy suların gurhagur axsın,
Sinəmin üstündən keçsin sellərin.
Başımın üstündə şimşək də çaxsın.
Qoy tufan qoparsın əsən yellərin!

Doyunca çarpışıb qasırğalarla,
Göydə qartal kimi yorulum mən də,
Sonra qoşa yatıb dostum baharla
Baş-başa, dincəlim bir göy çəməndə...

Dən olub səpilək, gəl səninlə mən,
Göyərək torpaqda sünbüllər kimi;
Qızlar gülab çəksin qoy ətrimizdən,
Baharın zinəti al güllər kimi!

Qoşa çinar olub bitək yol üstdə,
Göylərə boy ataq öz ölkəmizdə.
Yayın istisində Muğanda, Mildə,
Yolçular dincəlsin, qoy kölgəmizdə.

Ya da dağ döşündə qoşa qaynayan,
Ürək sərinlədən çeşmələr olaq...
Yerdə bulud-bulud axıb oynayan
Sərin çaylar kimi axdıqca dolaq...

Yer qazaq, su çəkək boz səhralara,
Daş yonaq, söz yazaq iki əl kimi...
Göyləri şimşəktək biz yara-yara,
Gəzək yer üzünü bir əməl kimi.

Bir cüt ala gözlü göyərçin olub,
Gəl Yer kürəsinin çiyninə qonaq.
Şeir tək dillənib, nəğmə tək ötüb,
Dildən-dilə düşək, əzbər oxunaq.

Bir cüt məşəl olsun ürəklərimiz,
Bir cüt ulduz kimi baş-başa yanaq.
Sülhün, səadətin keşiyində biz
Gəl qoşa dayanaq, qoşa da yanaq!

Min il ömür sürək səninlə qoşa
Bir canda döyünən iki ürək tək.
Min il nəfəs verək torpağa, daşa,
Nəsildən-nəsilə təzələşərək...

*1953, 22 aprel*

## NEFTİN QÜDRƏTİ

Gəl ey dost, Xəzərin cəlalına bax
Buruqlar dayanmış ehramlar kimi.
Dənizdə hər gecə süd kimi dümağ
Ulduzdan, incidən, almasdan parlaq
Neçə min od yanır, neçə min çıraq,
Sularda sayrışan ağ şamlar kimi...
Yox, yox, işıq deyil, ürəkdir yanan –
Ürəkdir əməli ərşə dayanan.
Yandıqca sönməyən ilhamlar kimi!..

Bakı fəhləsinin tunc sinəsində
Köpüklü dalğalar parçalandıqca,
Dənizin altında daima dustaq,
Günəşdən, havadan, insandan uzaq
O yerlər oyanır mator səsindən,
Həzz alır insanın xoş nəfəsindən.
Fırtına çalxanıb su bulandıqca,
Bir yeni sürətlə yer dolandıqca...
Yeraltı dünyalar yer üstə çıxır,
İnsan əllərini zəfərlə sıxır...

Dayan! Ey fırtına! Dayan! Ey külək!
Nə üzünü bozart, nə də inad ol.
Daşların bağrından cövhər çəkərək –
Ağzı qıfıllanmış xəzinələri
İnsana qaytarır insan əlləri...
Sən də sevin buna, sən də gəl şad ol!
Şair, sürət ilə yaz bu sürəti
İllərin şöhrəti illərə düşsün,
Yaz ki, yurdumuzun böyük neməti
Neftin nəğmələri dillərə düşsün.

## I NƏĞMƏ

Elə ki, qapını qara qış kəsir
Evlərin üstündə tar bağlayır qar.
Külək qılınc kimi insanı kəsir,
Sarı yarpaq tökür boylu çinarlar.
Elə ki, bağlanır dağların yolu,
Çayların üstündən buz körpü salır.
Nəfəsi çovğunla, boranla dolu
Qış günü, evlərdə yurd-yuva salır.
Elə ki, yer düşür min yaraşıqdan
Saralır yam-yaşıl mənzərələr də,
Yer istidən qalır, göy də işıqdan
Bağlanır qapılar, pəncərələr də:
Canımız soyuqda donana kimi
O öz nəfəsilə isidir bizi.
Bağrına basaraq bir ana kimi
Qoynunda qızdırır əllərimizi.
Sən bu həqiqəti sadə saysan da,
İşıqsız göz olmaz, istisiz ürək...
Donar damarlarda buz kimi qan da
Evlərdə at çapar boranla, külək.
Donar dəzgah üstə ipək toxuyan
Vətən qızlarının şam barmaqları.
Donar dəftər yazıb, kitab oxuyan
Körpə uşaqların gül yanaqları...
Nəhəng zavodların qəlbi dayanar,
Şumlara mıxlanar min traktor da.
Təbiət yuxudan çox gec oyanar...
Lal olar gur səsli yüz min mator da.
Mənim qələm tutan əlim də donar,
Üstəlik ağzımda dilim də donar.
Yaxşı bax, gör neftin qüdrəti nədir,
Elə zənn etmə ki, bu əfsanədir.

## II NƏĞMƏ

Həyatdır vaxt olur, xəstələnirik,
Astadan danışır gur səsimiz də.
Ölümlə üz-üzə yaman gəlirik
Az qalır kəsilə nəfəsimiz də.
Od tutub yandıqca hey bədənimiz
Dalğa-dalğa vurur beynimizə qan;
Ayıq ağlımızı şaşırırıq biz,
Ah-uf da deyirik, şirin olur can.
Boğmağa cəhd edir öz pəncəsilə
Böyük bir insanı adi sətəlcəm.
Əzizlər ağlaşır asta səs ilə,
Bir salxım buz olur ürəkdəki qəm...
İnsana üz verən bu dar ayaqda
Neftimiz dəyişib bir dərman olur.
Ürək təngənəfəs olduğu vaxtda
O saf bir qan olub ciyərə dolur...
Xəstəmiz tərpənir gülümsəyərək
Gözünə bir şirin yuxu da gəlir.
Qəfəsdə quş kimi çırpınan ürək
Yorğun döyüşçü tək yatıb dincəlir.
Yaxşı bax, gör neftin qüdrəti nədir,
Elə zənn etmə ki, bu əfsanədir!

## III NƏĞMƏ

Torpağa qarışır o bir gübrə tək,
Deyir ki, anamız yer qocalmasın.
Bağların üstünü ölüm almasın,
Arazın suyundan bol-bol içdikcə
Özü də bağçada qızıl gül olur.
Fəsillər dolanıb zaman keçdikcə
Tarlada şaxəli bir sünbül olur.
Bəzən ipək üstə ətirlər saçır
Bahar müjdəçisi bir çiçək kimi.

Bəzən də şal üstə o qanad açır
Güldən-gülə qonan kəpənək kimi.
Gah abı rəng olur, gah da qırmızı
Yanır libaslarda o çıraq-çıraq.
Bəzənir yurdumun gəlini, qızı
Təpədən-dırnağa geyinir dümağ.
Hələ bağçalarda o qatar-qatar
Qaçan körpələrin atdığı nədir?
Əldən-ələ keçən o rezin toplar
Neftdən uşaqlara bir hədiyyədir.

## IV NƏĞMƏ

Neftin nəfəsində nə qüdrət varsa,
Cansız dəmiri də əridir birdən.
Hücuma hazır ol! Əmri alarsa,
Dağ boyda tankı da tərpədir yerdən.
O hər cahangirin, hər qəsbkarın
Yolunda bir yanğın, bir vulkan olur.
Bizim qoşun-qoşun polad tankların
Soyuq gövdəsinə isti qan olur.
Boranda, şaxtada, palçıqda, qarda,
Alovu sərniyib odu sönməyir.
Yorulub atmayır o bizi darda
Adını unudub üzü dönməyir...
Bir alim dostumdan soruşdum ki, mən:
De görüm “T-1”in mənası nədir?
Dedi: Öz səsindən qabaqda gedən
İldırım sürətli bir təyyarədir...
Yığıb qanadını qırğı sayağı
Şığıyıb süzəndə o bir ox olur.
Geniş fəzalardır onun oylağı
Bircə an içində gözdən yox olur.
Ona təslim olur göylər, ümmanlar,
Fikirdən yavaşdır, şimşəkdən yeyin...
Onun qanadında saatda beş min

Kilometr uçacaq sabah insanlar...
Reaktiv ad vermiş alimlər ona,
Bir zaman Marsa da yol gedəcəkdir.
Bu sürət yaraşır torpaq oğluna,
O ayı, ulduzu fəth edəcəkdir!
Bu günsə onların qulağı səsdə...
Göydə vuruşduqca qasırğalarla
İnsanlar sağ əli gözünün üstə
Onları seyr edir min iftixarla...
Bir rus aliminin böyük başı da,
Sürətin, işığın ilk sirdaşı da,
Ucalır göylərə bu iqtidarla.
O polad qartallar dağlar aşdıqca,
Göydə buludlarla qucaqlaşdıqca,
Bakı fəhləsi də baxır vüqarla
Çarpışır Xəzərdə sərt dalğalarla...
Yaxşı bax, gör neftin mənası nədir?
O şimşək qanadlı bir təyyarədir!
Elə zənn etmə ki, bu əfsanədir!
Gəl ey dost, Xəzərin cəlalına bax:
Buruqlar dayanmış ehramlar kimi,
Dənizdə hər gecə süd kimi dümağ,
Ulduzdan, incidən, almasdan parlaq
Neçə min od yanır, neçə min çıraq,
Sularda sayrışan ağ şamlar kimi...
Yox, yox işıq deyil ürəkdir yanan –
Ürəkdir əməli ərşə dayanan
Yandıqca sönməyən ilhamlar kimi!..

*1953, 30 sentyabr*

## LALƏ

Lalə, rəngindəki yanğın, de, nədir?
Niyə məlulsan, a dağlar qızı, sən?
Qara qanlarmı gedir qəlbindən?
Hansı dərd, hansı şirin xatirədir
Səni odlarda yaxan?
O uzaq yollara həsrətlə baxan
Qara gözlər, de, neçin dolğundur?
Lalə rəngin nə yaman solğundur?

Lalə, qalx! Gün yayılıb dağdan aşır,
Yel əsir, axşam olur, çay da daşır.
Quşlar, insanlar uçur öz yerinə,
Sənsə yalqız, əli qoynunda yenə
Qəlbin, eşqin kimi tək
Tozlanan yollara göz gəzdirərək
Ah çəkirsən, de nədən?
Lalə, bəsdir! Onu gəl gözləmə sən.
Keçdi üstündən o dəhşətli bulut...
İçdiyin andı, quzum, sən də unut!
Yüz il ansan da onu xatirə tək
O vəfasız qayıdıb gəlməyəcək...

*1954, 22 dekabr*

## MUSA CƏLİLƏ

O gün ki, üstünü cəlladlar aldı,
Günahsız töküldü müqəddəs qanın.
Bizim dərdimizdir, yarımçıq qaldı
Sənin söz dastanın, həyat dastanın.

Biz səni sevirdik canla, ürəklə,
Çünki sən ürəklə sevirdin bizi.
Çalardın sazında minbir diləklə
Bizim eşqimizi, iradəmizi!
Qardaş! Sən ürəklə sevirdin bizi.

Yarandın, yaşadın şanlı bir gündə
Sözün ulduz-ulduz, çiçək-çiçəkdir.
Xatirən daima torpaq üstündə,
Yaşıl bir ot kimi göyərəcəkdir...

Sənin qəlbin kimi safdır, dümağdır
Vətən göylərinin ağ ulduzları.
Adına nəğmələr oxuyacaqdır,
İdil yılğasının tatar qızları.

Mənim şair dostum, şair qardaşım!
Vüqarın böyükdür uca dağ kimi.
Sənin hünərinlə mənim də başım
Ucaldı göylərə bir bayraq kimi...

Neçə sərhəd aşır, el gəzir şeir,
Yurd salır neçə min ürəkdə, canda.
Sənə oğlum deyir, öz balam deyir,
Mənim ana yurdum Azərbaycan da!

*1954*

## MƏN TƏLƏSMİRƏM...

Dostlar, badələri qaldırın içək!
Gecə ulduzludur, hava da sərin.
Demirəm məst olub dünyadan keçək...
Deyirəm mehriban düşüncələrin
İsti qucağında qızınaq bir az...
Qoy uzansın gecə, geciksin səhər,
Yuxuya getməsin məclisdəkilər –
Mənim söhbətimdən yorulmaq olmaz.
Hələ yer üstündə, insan yanında
Deyib danışmaqdan doymamışam mən...
Uzadaq ömrünü hər bir anın da,
Yel kimi keçməsin vaxt üstümüzdən...
Bu aylı gecədə, bu dağ döşündə,
Bu sazlı, söhbətli bulaq başında
Bu saat, bu dəm
Heç yana, heç yerə mən tələsmirəm!

Sevgilim, qolunu boynuma dola!
Demə ki, yorğunam, ya qocalmışam.
Mən hələ dünyadan nə zövq almışam?
Dur, bütün aləmi gəzək qol-qola!
Yenə də fikrimin səyyar yelkəni
Dənizdən-dənizə atsa da məni,
Qorxma! Ürəklə de: "Uğurlar ola!"
Dur, bütün aləmi gəzək qol-qola.
Sellərdən, sulardan yeyin axsam da,
Şimşəklə yanaşı göydə çaxsam da,
Nə şadlıq səyirtsin atını, nə qəm,
Heç yana, heç yerə mən tələsmirəm!..

***

Sən də, ovçu dostum, tələsmə sən də,
Bu qəlbi dağları qoy asta aşaq.
O çay yanındakı yaşıl çəməndə

Asta addımlayıb ağır dolaşaq.
Hər gülə, çiçəyə salam verməsəm,
Xoş üz göstərməsəm, xoş üz görməsəm;
Nanələr, reyhanlar inciyər məndən.
Güllərin yarpağı tökülər dən-dən...
Odur ki, yel olub çöldə əsmirəm,
Heç yana, heç yerə mən tələsmirəm!

***

Bulud tez keçməsin başımın üstdən,
Çay da yavaş axsın... sular boyunca.
Baxım hər zərrəyə, baxım doyunca...
Ürək tərpənməyir ötərgi səsdən,
Nə çıxar bir anlıq yanan həvəsdən?

***

Elə zənn etmə ki, ağırlaşmışam,
Ayağı sarıqlı, şikəst bir quşam...
Qoy dünya böyüsün, zaman uzansın
Bir günün ərzində aylarla yansın.
Al günəş, gözündən nur yağa-yağa...
Ömrün kitabını tamamlamağa
Çox da can atmasın əlimdə qələm,
Mən tələsmirəm,
Mən tələsmirəm!

*1954*

## GÖDƏKCƏ

Dostum! Moskvada, iki il qabaq,
Qarlı bir qış günü bir evə dolduq.
Dostlar, tanışlar da məclis quraraq,
Üstünə yüngüllük, gülüb şad olduq.
Mən soyuqlamışdım o axşam bir az,
Sənsə ərk eləyib danladın məni.
Dedin ki, bu qədər soyuqluq olmaz,
Özünə baxmırsan... Doğrudan da sən.
Elə bil canının lap düşmənisən!
Sonra əynindəki bir gödəkçəni
Mənə bağışladın o məclisdəcə.
Üstəlik bir söz də dedin o gecə:
“Biz heç... Qoy şairə soyuq dəyməsin!”
O ürəkdən gələn mehriban səsin
İndi də, indi də xatirimdədir...
Əzəldən qaydadır eldə, obada,
Dostluğun töhfəsi bir çöp olsa da,
Anlayan bilər ki, mənası nədir.
İndi qış günləri şaxtada, qarda
Əlimdə tüfəngim çöllər gəzirəm.
Arabir yol azıb qasırğalarda,
Bir işıq axtarıb ellər gəzirəm.
Gah şər qarışanda, gah da dan üzü
Sazaq qılınc kimi kəsəndə məni,
Geyirəm verdiyin o gödəkçəni,
Elə bil gül açır Mil, Muğan düzü.
Bəzən Bakıda da xəzri əsəndə,
Elə ki, qəflətən xəstələnirəm,
Elə ki, qorxudur məni sətəlcəm,
Uşaqlar deyinib, həmdəm küsəndə,
Geyirəm verdiyin bu gödəkçəni.
Bu ceyran dərisi bir loğman kimi
Davasız, dərmansız sağaldır məni.
Xeyirxah, mehriban bir insan kimi,
Hər zaman, hər yerdə anıram səni...

*1955*

## YADA SAL MƏNİ

Aşıq Şəmşir, Dəlidağdan keçəndə
Kəklikli daşlardan xəbər al məni.
Ceyran bulağından qızlar içəndə
Saz tutub, söz qoşub, yada sal məni.

Hay vurub, qıy vurub, səs sal dağlara,
Gözəllər oylağı göy yaylaqlara.
Mənim bu dərdimi de oylaqlara –
Sinəmdən oxladı bir maral məni.

O ceyran baxışlı baxdı uzaqdan,
Canımı odlara yaxdı nahaqdan.
Yüz il də dolanıb keçsə o vaxtdan
Unutmaz aləmdə əhli-hal məni.

Gəlmişəm gəzməyə sizin dağları,
Baxım yaylaqlara doyunca barı.
Bu yerə şairin düşdü güzarı,
Gözəl qarşıladı xoş iqbal məni.

Bəxt məni bu yerə qonaq göndərdi,
Gedirəm, yamandır ayrılıq dərdi;
Demə Səməd Vurğun gəldi-gedərdi,
Unutmaz bu oba, bu mahal məni...

*1955, 22 iyul*

## QÜRBƏT ELDƏ

Vaxtsız əcəl, get o yanda dolan, dur,
Qürbət eldə can vermərəm ölümə!
Qılıncını məndən uzaq dolandır,
Görürsən ki, qələm aldım əlimə,
Qürbət eldə can verməərəm ölümə!..

*1955, noyabr*

## DOSTLUQ HƏDİYYƏSİ

Qardaş! Sənin axar təbin
Axdı təmiz sular kimi;
Hər muradın, hər mətləbin
Gah yeridi, gah atlandı,
Tərlan olub qanadlandı
Müqəddəs arzular kimi!

Ömrün boyu sən inandın
Bu torpağın qüdrətinə.
Vətən oldu əzəl andın;
Qulaq asdın sərin-sərin
Dünya görmüş bu ellərin
Hər sazına, söhbətinə.

Şirin dilin, şirin ləhcən
Yurdumuzun öz səsidir...
Rübabını çalanda sən
Dindi dağ da, göy çəmən də,
Dedi hamı, dedim mən də:
Bu Osmanın nəfəsidir –
Yurdumuzun öz səsidir!..

Kosmopolit iş başında
Səni dandı, məni dandı...
Sən atını sürən zaman
Od qopduqca nallarından
Paxılların küt başında
Ocaq yandı, od qalandı!

Bir döyündü ürəyimiz, –
Bir əmələ qoşa getdik.
Gah ləpəli, gah dalğalı,
Gah da çənli, qasırğalı
Şeir, sənət yolunu biz

Vüqarla baş-başa getdik,
Bir əmələ qoşa getdik!..

Getdik, dedim... Yox, inanma!
Mənzil yarı, ömür yarı!
Mən dayansam, sən dayanma!
Qartal kimi dağlar aşsın,
Buludlarla qucaqlaşsın
İlhamının qanadları!

Mən bilirəm o səndəki
Vüqar nədir, təmkin nədir!
Bilirəm ki, sinəndəki:
Hələ sirri açılmamış,
İnciləri saçılmamış
Qapalı bir xəzinədir...

Bilirəm ki, el yanında
Alnı açıq, üzü ağsan.
Bilirəm ki, saf qanında
Dalğaların qüvvəti var,
Şerin, sözün qüdrəti var,
Hələ nələr yazacaqsan,
Nə nəğmələr yazacaqsan!..

*1955, 17 dekabr*

# YAZILMA TARİXİ MƏLUM OLMAYAN ŞEİRLƏR

## ŞİKAYƏT

Qulaq asın, dost-aşnalar,
Bir pərişan kamanım var.
Bu rübabın hər telində
Yüz ahım var, amanım var.

Nə tez keçdi ilk baharım,
Xəzan əsdi, soldu barım,
Nə dövrana etibarım,
Nə insana gümanım var.

Sazım hanı? Sözüm hanı?
Uçdu könlüm xanimanı...
İtirmişəm el-obanı,
Nə bir dağım, aranım var.

Könül! Daha kimsəsiz gəz
...........................................
Bir dağam ki, göz işləməz,
Karvan keçməz dumanım var.

## DAĞLAR

Üstündən karvan yeriməz,
Sıxdır dumanların, dağlar!
Yayda-qışda heç əriməz
Quzeylərdə qarın, dağlar!

O qız yaldan tək aşanda,
Saç kəmərə dolaşanda,
Atdan düşüm yol aşanda
Mən olum zəvvarın, dağlar!

Laçınların göydən enməz,
Qayaların baxar dinməz,
Yaman gündə üzün dönməz, –
Pozulmaz ilqarın, dağlar!

Ovçu gəzər oğrun-oğrun,
Maralların düşər yorğun.
Qonaq gəlib sizə Vurğun
Sevinsin gülzarın, dağlar!

## QƏZƏL

Hər bağın, hər bağçanın bir bülbüli-şeydası var.
Hər duyan qəlbin, əzizim, gizli bir sevdası var.

Ruhu oxşar, qəlbi oxşar incə bir canan səsi,
Gah gülər, gah ağlayar, hər dəmdə bir mənası var.

Can alan hər nəğmənin mənası yalnız eşqdir,
Göz görüb əl çatmayan ulduzlu bir dünyası var.

Dərdi-hicran günlərilə ömrü odlardan keçər,
Hər könül bir karvandır ki, bir susuz səhrası var.

Böylə bir söz var ki, Vurğun indi bir Məcnun olub,
Şerü-sənət adlanan nazəndə bir Leylası var.

## QƏZƏL

Aləmin seyrinə gəl, gör nə gözəl fitrəti var,
Hər gülün, hər çiçəyin öz adı var, surəti var.

Qulaq as bülbülün avazına, sevda dəmidir,
O çəmən güllərinin bir-birinə ülfəti var.

Sığmaz idraka bu dünya evinin sirrləri,
Varlığın hüsni-əzəldən nə böyük qüdrəti var.

Dolaşıb aləmi Loğman kimi məna gəzirəm,
Çünki mənalı keçən günlərin ülviyyəti var.

Ay da, ulduz da, günəş də yerə həsrətlə baxır,
Hər bəşər qəlbinin öz məclisi, öz söhbəti var.

Məni yelkən kimi qərq etsə də dəryada zaman,
Vurğun öldü deməyin, bir əbədi sənəti var...

## QƏZƏL

Meysiz, məzəsiz can ilə canan ola bilməz!
Sevda dediyin hər kəsə meydan ola bilməz!

Arifləri dindir ki, nədir şeir ilə sənət?
Şair yaranan əmrə peşiman ola bilməz!

Könlüm evi bir gülşənə bənzər ki, əzizim,
Min badi-xəzan əssə də viran ola bilməz!

Qəlbin, ürəyin odlarına yanmasa bir söz
Dillərdə, ağızlarda o, dastan ola bilməz!

Girdim günəşin qoynuna, min bir səhərim var,
Bülbül də mənim, gül də, zimistan ola bilməz.

Yüksəl, fəqət insanlığa pis gözlə baxanlar
Dünyada bir ad qoysa da, insan ola bilməz!

Xoşbəxt elimin, yurdumun öz Vurğunuyam mən,
Bundan da gözəl bir daha dövran ola bilməz!

## ƏGƏR SƏNDƏN DÖNƏR İSƏM, NƏSİBİM AHU-ZAR OLSUN!

Əgər səndən dönər isəm, nəsibim ahu-zar olsun!
Baharım qar tökən qışlar, açılmaz bir diyar olsun!
Çəmənzarım, bağım-bağçam saralsın, həpsi xar olsun!
Məzarım od tutub yansın, bu eşqim aşikar olsun!

Sus, ey bülbül, kəs ey tufan, məramım istirahətdir,
Bu yerlərdə payım yoxmuş, əlacım bir səyahətdir;
Ölüm!.. Ey vah, o nemətdir, o bir şanlı səadətdir.
Əgər vaxtsız ölər isəm rəqibim bəxtiyar olsun!

Fələkdən intiqam istər, qopub ruhumda tufanlar,
Nə insafsız, nə vicdansız olurmuş yarəb, insanlar!
Yaz ey Vurğun, çağır qopsun bu gün aləmdə tufanlar,
Dağılsın mehvəri-aləm kökündən, tarimar olsun!

## MEFİSTOFEL, YAXUD DOST CİLDİNDƏ DÜŞMƏN

Mefistofel! Mefistofel! Səni ölmüş sanırdıq biz,
Fəqət sağsan, "əfv elə" ki, görməmişdir gözlərimiz.
Bizim dostluq tarixçəmiz beş-altı il sürdü ancaq,
Bu səhvimçün ana yurdum məndən hesab almayacaq.
Çünki şair xəyalımın qanadları çox səyyardır,
Yaşayanın, yaradanın yanılmağa haqqı vardır.
Mefistofel! Mefistofel! Bizim dildə nəçisən sən?
Beyin yeyən, könül yaxan... Şirin dilli bir iblissən.
Yadımdadır o məclislər, o badələr, o nitqlər...
Sən də danma o günləri öz hünərin varsa əgər.
Yadındamı asta-asta çox girərdin qılığıma,
Fəxrimizsən deyib mana, hey içərdin sağlığıma.
Deyirdin ki, şeir-sənət şöhrətisən yurdumuzun,
Qoy hər sözün dastan olsun, taleyin ağ, ömrün uzun.
Deyərdin ki, öz canımı sənə qurban verməsəm mən,
Oğlum, qızım pay almasın bu dünyanın nemətindən.
Mənsə canlı ürək kimi aldanardım bu ülfətə,
İnsan oğlu inanmaqla ucalmışdır ülviyyətə.
İnanmamaq iblislərin, əqrəblərin fitrətidir,
Böyük sənət əsərləri bir etiqad qüdrətidir.
Etibarsız, məhəbbətsiz hər üzünə keçən ömür,
Xəyanətdən ilham alan şərəfsizə xoş görünür.

## KAMALA YETƏK

Gəl ana torpağım! Gəl məni dinlə,
Mən sənin qəlbindən qopan bir səsəm.
Baxıb gül hüsnünə nə dastan desəm,
Sən ona zinəti ver əllərinlə!

Az söz qoşmamışam hər cəlalına,
Çünki vurğunuyam mən bu yerlərin.
Dastanlar yazmışam gül cəmalına
Qərib axşamların, al səhərlərin.

İndisə başqadır mənim diləyim
Nə çıxar bu qədər can-can deməkdən?
Bu gün söz açmıram tərifləməkdən
Başqa bir istəklə yanır ürəyim.

Fikir ver sözümə, nazəndə Vətən!
Gəl səni şərh edim bir loğman kimi.
Min söz uydursa da hər yoldan ötən...
Mənim bu şerimi iç dərman kimi!..

Açdım ömrümüzü hey varaq-varaq
Gördüm açılmamış boş səhifələr...
Çox gəzib axtardım mən çıraq-çıraq
Yazıq ki, tapmadım kamil bir əsər.

Çox zaman uyuruq alqışlara biz
Deyirik kamala yetişdik daha!
Bu gün sevilsə də əsərlərimiz,
Bir şölə saçmayır onlar sabaha...

Bizim gəncliyin də bir çox dərdi var:
Sevirəm onların həyat səsini.
Əfsus ki, bilməyir hələ də onlar
Nə öz dilimizi, nə özgəsini!

Yarımçıq elm ilə, yarımçıq savad
Gəncliyin üstündə böyük ləkədir.
“Savadsız müəllim!..” Bu gülməli ad
Gələcək günlərə bir təhlükədir...

Bəzən bir alimin çox iftixarla
Dediyi özgənin fikirləridir.
Qurtarır nitqini baxır vüqarla,
Elə bil öz sözü, öz hünəridir.

Bəzən də nəşəmiz dolu bir gündə
İçib qızışırıq biz birdən-birə.
Ötərgi bir duyğu, bir söz üstündə
Onillik dostluğu vururuq yerə...

Tarixin qocaman bir qanunu var:
Kamalsız bir hünər solur çiçək tək...
Mənim əllərimlə yazılan qərar
Zamanın hökmüdür: kamala yetək!

Bəzən də ağıllı sayılan sözlər
Bir qığılcım kimi parlayıb sönür...
Mənasız çay kimi dayaz bir əsər
Bizim gözümüzə ümman görünür.

Günah nə gözdədir, nə də çeşməkdə
Məqsədim başqadır bunu deməkdə,
Kimin ki, sevdası, qəlbi dayazdır,
Kimin ki idrakı, kamalı azdır,
Baxıb damcı boyda görür dənizi,
Sonra da qarışqa zənn edir bizi...

Görürsən tovlayır qəlbi ehtiras,
Kor kimi gedirik onun dalınca.
Hardasa nəşəmiz kökəlir bir az,
Sonra da soyuyub məyus qalınca,

Min lənət deyirik iradəmizə,
Kefimiz sonradan dərd olur bizə.

Şair, nə üçündür bu sayıqlaman?
Kim qulaq asacaq bu nəsihətə?
Beş günlük dünyanın qonağı insan,
Rəvamı qul olsun bir məhəbbətə?
Dəymə? Öz kefindən qalmasın heç kəs,
Həyat bir qalıba sığışa bilməz!

## KƏKLİK

Onun qaydasıdır binadan, başdan,
Hələ gün çıxmamış qalxıb obaşdan,
Çıxar qoşa-qoşa dəlikli daşdan,
Düşər yavaş-yavaş aşağı kəklik.

Əlində al-yaşıl gələndə bahar,
Dağların başında əriyəndə qar,
Dərədən, kolluqdan dağlara qalxar
Yayınar gözümdən uzağa kəklik.

Hərdən ovçu görüb qaqqıldaşanda,
Uçub qatar-qatar dağlar aşanda,
Səs salır bu dağdan o dağa kəklik.

## RUSTAVELİ

Xaqanilər, Nizamilər yetişdirən bir vətənin,
Oğlu, qızı şeir yazır yubileyinə bu gün sənin.

Bu gün bizim yurdumuzda bir bayramın təntənəsi,
Bu dağlardan o dağlara əks olunur şerin səsi.
Səhər tezdən bülbül uçur, qonur yaşıl bir budağa,
Könül deyir sən də bəzən, sən də geyin dur ayağa.
Bir şərqi qoş, hörmət olsun bizim qardaş sənətkara,
Səhər-səhər al günəşin saçlarını yaxşı dara.

Olsun! Könül sirdaşımdır dost sözündən çıxmaq olmaz,
Nəğməmizdən ilham alır ulduzlu qış, çiçəkli yaz.
Rustaveli! Gəl qardaşım, əlində bir zərif lələk,
Bu günlərə şeir desin sinəndəki böyük ürək.
Sən görəndə dumanlıydı Gürcüstanın dik dağları,
Bir ölkənin göz yaşıydı şır-şır axan bulaqları.
At çapardı yurdumuzda yoldan keçən min bir yağı,
Açılmazdı sənin könlün, açılmazdı ay qabağı.
O günlərdən xatirədir min vicdanın hekayəti,
Xaqaninin, Nizaminin, Füzulinin şikayəti.

Mən görmüşəm Gürcüstanı, oylağıdır gözəllərin,
Coşqun axan çayları var, bulaqları sərin-sərin.
Yaz gələndə çox sıx olur Gürcüstanın ormanları,
Yel əsəndə dörd bölünür bu dağların dumanları.
Könüllərdə dustaq deyil hər vicdanın, ömrün kamı
Uca dağlar başındadır igidlərin istehkamı.
Əsrlərin yuxusundan göz açmışdır böyük insan
Oxuyuruq tarixləri bu dağların yazısından.

## AXAR ÇAYLAR

Yaz gələndə daşıb gələr,
Dağı-daşı aşıb gələr,
Göylə qucaqlaşıb gələr,
Heç dincini almaz bir az –
Könlüm kimi rahat olmaz;
Hey gəzişər, hey dolanar,
Gah durular, gah bulanar.
Mənzil kəsər,
Uzun yollu,
Neçə qollu,
Axar göllü
Axar çaylar.

Şütüyər bir ilan kimi,
Göy xallı bir qulan kimi.
Hərdən hirsə dolan kimi
Ürəyində kin saxlayar,
Yeri, göyü ayaqlayar,
Qayaları dəlib keçər,
Dağa girər, daş gəmirər.
Dəli selli,
Başı yelli,
Ağır elli
Axar çaylar.

Dağdan dağa, düzdən-düzə,
Axıb gedər süzə-süzə.
Ayna tutar üzümüzə,
Salam verər ömrümüzə.
Dörd yanında göy çəmənlər,
Qərənfillər, yasəmənlər.
Söyüdlər də çiçək açar.
Ceyran qaçar, turac uçar.

Şəfalıdır,
Səfalıdır.
Yanı güllü,
Şux bülbüllü,
Göy sünbüllü
Axar çaylar.

Gəzər dağ-dağ, təpə-təpə,
Çəmənləri öpə-öpə.
Dalğa-dalğa, ləpə-ləpə,
Aşıb daşar, daşıb aşar,
Pıçıl-pıçıl pıçıldaşar,
Şəlalələr qardaşıdır
Sərçeşmələr sirdaşıdır.
Məzəlidir,
Qəmzəlidir.
Şirin dilli,
Sərin yelli,
Dalğa telli
Axar çaylar.

Yaxasında bənövşələr,
Kölgə salar göy meşələr.
Axşam-axşam, səhər-səhər,
Xoş havası sərin olar,
Lalladıqca dərin olar,
Gərdəninə zümrüd taxar.
Başı yaylaq,
Yanı oylaq,
Üstü xallı,
Kol marallı,
Qeyli-qallı
Axar çaylar.

## QIZ VƏ ROMAN

Güllü sarmaşıqlar içində yalqız
Yaşıl bir eyvanda sevdalı bir qız.
Yuxuya getmişdir, o gözəl pəri
Bəlkə də sirli bir xəyala dalmış
Üzündə sayrışır ay şəfəqləri
Mehrab o dilbərə çıraqmı salmış?

Dağılmış saçları o gül üzünə,
Oxşayır alnını sərin bir rüzgar.
Gözəl təbiətin bu saf qızına.
Günəşli gündüzlər aylı axşamlar
Əlvan şəfəqlərdən rübənd toxuyur,
Adına bülbüllər dastan oxuyur.

Təbiət çox sevir insan oğlunu,
Təbiət qoynunda bəsləyir onu.
Bu cansız görünən hər daş, hər qaya
Axşamlar söz açır ulduza, aya.
Məncə, təbiətin böyük qəlbi var,
Dünyanın qəlbidir bizim insanlar.
Ömürlər günəşdən busələr alır,
Axan şəlalələr buna əl çalır.

Bəzən şırıl-şırıl axdıqca bir su,
Ürəkdə nazlanır insan duyğusu.
Xəyal qanadlanır, uçur göylərə.
Ulduzlu göylərdən gül dərə-dərə
Bütün kainatı seyr edir insan.
Dünyalar yaranır hər arzusundan,
Yaz bunu, burnunu sallayıb yenə
"Təbiət nə gərək sovet şerinə"
Deyən şairlərin ömrü gödəkdir,
Təbiət insanla gün görəcəkdir.

Yatır sevdalı qız, o yorğun maral,
Gözəlsiz ağlayır ən böyük xəyal.

Qızın yanaqları çiçək-çiçəkdir
Bizim el dilində gözəl-göyçəkdir.
Yatır sinəsində açıq bir roman
Külək oynatdıqca varaqlarını
Qızcığaz oyanır ağır yuxudan
Azca sığallayır yanaqlarını
Sonra şirin-şirin yuxuya gedir.
Bu gözəl aləmi yenə tərk edir.

Oyan, təbiətin vicdanı pəri,
Dil açsın qəlbinin gözəl telləri,
Sənsiz bu kainat vaxtsız qocalar,
Dünyanın romanı yarımçıq qalar.
Günəş həsrət çəkər o gül üzünə,
Sənin o mehriban ana dizinə,
Dahilər baş qoyub xəyala dalmış,
Qoynunda yaz olur hər boranlı qış.

Yatır sevdalı qız, o nazlı canan,
Yatır sinəsində açıq bir roman.
Oxumuş dastanı bu gözəl pəri
Fəqət bir nöqtədə ala gözləri
Taqətdən düşərək birdən yumulmuş
Nə deyim? Bəlkə də o qanadlı quş
Sevdiyi bir gənci anaraq yenə
Batmış məhəbbətin dərinliyinə,
Bəlkə xəyaldadır, yatmamış o qız?
Külək, gəl oyatma sən onu vaxtsız,
Ayırma sevdalı bir kainatdan
Bəzən şirin olur yuxu həyatdan.
Yatır sevdalı qız ruhu mehriban,
Yatır sinəsində açıq bir roman.
Həyat da romandır, o yaradılır
Dünya binasını qoyandan bəri.
Tez-tez varaqlanır, tez-tez dadılır,
Gah şirin, gah acı səhifələri.
Fəqət bu romanı sonuna qədər
Oxuyan olmuşmu barı bir nəfər?

# MÜNDƏRİCAT

## ŞEİRLƏR

## YAZILMA TARİXİ MƏLUM OLMAYAN ŞEİRLƏR

